

*Mən Aşığam, lələ mən,*
*Qəflətdəyəm hələ mən.*
*Dərddən, qəmdən, hicrandan*
*Bağlamışam şələ mən.*

**Sarı Aşıq**

# Laçın yurdu

**№1(22)**
**2018**

**Bakı-2018**

**Laçın yurdu, №1(22), 2018**
**Bakı, "Elm və təhsil", 2018. – 96 səh.**



Hüquqi ünvan:
**Mərdanov qardaşları 98**
Əlaqə:
**Tel.: (050) 291-34-52, (055) 363-20-37, (050) 205-00-92**
e-mail: **lachinyurdu@mail.ru** və ya **lachinyurdu@gmail.com**

Dərgidə dərc olunan yazılar müəlliflərin mövqeyini əks etdirir
və yazı müəllifləri məsuliyyət daşıyır.
Jurnal 16.03.2010-cu il tarixdə Azərbaycan Respublikasının Ədliyyə
Nazirliyində 3133 №-li reyestrlə qeydiyyatdan keçmişdir.

Bankın adı: **Azərbaycan Beynəlxalq Bankı MƏTBUAT şöbəsi**
Bankın kodu: **805142**,
Müxbir hesabı:
**AZ03NABZ01350100000000002944,**
VÖEN: **9900001881**
SWIFT: **IBAZAZ2X**,
Müştərinin hesabı:
**AZ64IBAZ41040019443136196216**
**Məmmədov Arif Kamran oğlu**
VÖEN:**1401771462**

Intermediary Bank:
**Citibank NA, New York, USA**
Corr. account: **36083186**
SWIFT: **IBAZAZ2X**,
International Bank of Azerbaijan Republic
Yasamal Branch
kod: **805142**
USD only Account #:
**AZ64IBAZ41040019443136196216**
**Mammadov Arif Kamran**
INN**: 1401771462**

## BU SAYIMIZDA

## HÖRMƏTLİ OXUCULAR!

“Laçın yurdu” jurnalını ancaq abunə yolu ilə əldə etmək olar. Çünki jurnalın “Azərmətbuatyayımı”nın köşklərində satışını dayandırmışıq.

Jurnal hələlik rübdə bir dəfə (ildə 4 nömrə) çıxır. İllik abunə qiyməti **12 manatdır.**

# 31 MART – AZƏRBAYCANLILARIN SOYQIRIMI GÜNÜ İLƏ BAĞLI ANIM TƏDBİRİ KEÇİRİLMİŞDİR





30 mart 2018-ci il tarixdə Laçın Rayon İcra Hakimiyyətinin təşkilatçılığı ilə Ağcabədi rayonu Taxtakörpü qəsəbəsində çoxsaylı rayon ictimaiyyəti nümayəndələrinin iştirakı ilə 31 Mart – Azərbaycanlıların soyqırımı günü ilə bağlı toplantı keçirilmişdir.

Əvvəlcə rayon ictimaiyyətinin nümayəndələri tərəfindən qəsəbədəki laçınlı şəhidlərin xatirəsinə ucaldılmış Şəhidlərin Xatirə Kompleksi ziyarət olunaraq abidənin önünə tər gül dəstələri düzülmüşdür. Laçın Rayon İcra Hakimiyyətinin inzibati binasının akt zalında soyqırım qurbanlarının xatirəsinin bir dəqiqəlik sükutla yad olunması ilə başlayan tədbiri giriş sözü ilə açan Laçın Rayon İcra Hakimiyyətinin başçısı Aqil Nəzərli 31 Mart – Azərbaycanlıların soyqırımı ilə bağlı tədbir iştirakçılarına ətraflı məlumat vermiş, erməni millətçiləri tərəfindən xalqımıza qarşı törədilən soyqırım və təcavüz siyasətinə ulu öndər Heydər Əliyevin ikinci dəfə hakimiyyətə gəlişindən sonra ilk dəfə hüquqi-siyasi qiymət verildiyini, bununla bağlı Azərbaycan Respublikası Prezidentinin 26 mart 1998-ci il tarixli Fərmanının tarixi əhəmiyyət daşıdığını bildirmişdir. Eyni zamanda bildirilmişdir ki, erməni millətçilərinin törətdiyi cinayətlərin dünya dövlətlərinin parlamentləri, beynəlxalq təşkilatları tərəfindən tanınmasına ölkə prezidenti cənab İlham Əliyevin apardığı çoxşaxəli siyasət sayəsində nail olunmuşdur.

Toplantıda "31 Mart Azərbaycanlıların Soyqırımı Günüdür" mövzusunda məruzə dinlənilmişdir.

Məruzə ətrafında çıxış edən rayon sakinləri və ictimaiyyət nümayəndələri azərbaycanlıların kütləvi surətdə qırğına, repressiyalara məruz qaldıqlarını, doğma yurdlarından didərgin salınaraq XX əsr tarixinin ən faciəli və dəhşətli hadisələri ilə üzləşdiklərini söyləmiş, bu hadisələrin səbəbkarlarına hiddət və nifrətlərini ifadə edərək hazırda ölkə prezidenti cənab İlham Əliyevin apardığı uğurlu daxili və xarici siyasət nəticəsində işğalda olan torpaqlarımızın tezliklə azad ediləcəyinə, qaçqınların və məcburi köçkünlərin dədə-baba torpaqlarımıza qayıdacaqlarına əminliklərini vurğulamışlar.

**O KƏND BİZİM KƏNDİMİZDİ**

## ARAXIŞ KƏNDİ



Mən çalışıram ki, kədərli yazılara önəm verməyim, amma bunu bacarmıram. Çünki kədər bəzən o qədər böyük olur ki, məndən asılı olmayaraq onu qəlbimin dərinliklərində gizlədə bilmirəm. Dünyada ən böyük müsibət, ən dəhşətli dərd didərginlikdir ki, o da yüz minlərlə soydaşımızın alın yazısına çevrilmişdir.

Çox-çox əvvəllərdən başlayaraq azərbaycanlılara qarşı törədilən faciələr, qırğınlar, sürgünlər heç vaxt səngiməmişdir. Daha dəhşətli faciələr isə keçən əsrin 30-cu illərində başlayan, minlərlə qurbanları olan repressiyalar oldu. Bu repressiyalar zamanı təkcə öz dolanışıqlarını yaxşılaşdırmaq üçün bir neçə xırda və iribuynuzlu heyvan, arı, müəyyən qədər ərzaq saxladıqlarına görə şərlənərək (məhsul oğurluğu) güllələnən və ya sürgün edilən insanların həyatına deyil, yüzlərlə yaşayış məntəqəsində yaşayışa da son qoyuldu.

**Kəndin tarixi durumu:** Qasımuşağı obasının qədim, lakin unudulmuş və itirilmiş tarixə malik kəndlərindən biri də Araxış kəndidir. Laçın rayonunun ərazisində yerləşən bu kənd haqqında məlumatı olanlar demək olar ki, ancaq yaşlı nəslin nümayəndələridir. Çünki kənd ötən əsrin əvvəllərində tamamən yer üzündən silinmişdir. Sadəcə kəndin yeri və adı bizlərə yadigar qalmışdır. Görəsən, bu ad bu gün bizlərə nələr danışır, nələr xatırladır?

Araxış toponimi barədə fərqli fikirlər mövcuddur. Bu da həmin söz birləşməsini yaradan komponentlərin doğru-düzgün müəyyənləşdirilməsini və tədqiq edilməsini önə çəkməyi zəruri edir. Araxiş, Araxoş və Araxış kimi qeydə alınan bu kənd öz adının ilkin formasını dəyişmiş, coğrafi mövqeyi ifadə edən qədim türk sözüdür.

Yerli əhali arasında Araxış toponimi haqqında müxtəlif maraqlı məlumatlar söylənilir. Heç bir elmi əsası olmayan məlumata görə, bu toponim “aralıq”, “ortalıq” və “xış” sözlərinin birləşməsindən yaranmış və “ara xış yerindən”, yaxud da “xışla əkilmiş sahənin araları”, “xış arası” anlamını ifadə edir. Əslində isə bu belə deyil.

Aparılan tədqiqatlar və ümumiləşdirmələr nəticəsində müəyyən edildi ki, bu toponimin tarixi çox-çox qədimlərə gedib çıxır. Əsrlərin yol yoldaşı olan bu ad cüzi dəyişikliyə uğrasa da, illərin sınağına dözmüş, günümüzə qədər gəlib çıxmışdır. Mənfur qonşularımız haylardan fərqli olaraq azər-

baycanlılar yer-yurd adlarını dəyişməyə, özününküləşdirməyə çalışmırlar. Çünki bu yer-yurdlar qədimdən oğuz, türk torpaqları olmuş, türk adları ilə adlandırılmışdır.

Aparılan toponimik mülahizələrdən aydın olur ki, hər hansı bir toponimin yaranma səbəbi, həmçinin yarandığı andan əsrlər boyu yaşamasında ilk növbədə həmin ərazidə yaşayan tayfa, qəbilə və xalqın varlığı, bundan başqa həmin yerin təbii görünüşü və relyefi özünü əks etdirir. Araxış toponiminin yaranmasında da yuxarıda sadalanan xüsusiyyətlərin bəziləri öz əksini tapmışdır.

Mənim bu toponimin etimologiyasına dair fikrim tamamilə başqadır. Doğrudur, mən də bu adın coğrafi şəraitə uyğun yaranmış olduğu qənaətindəyəm. Belə ki, kənd ərazisinin dağ ətəyində və təpəlik ərazidə olması, həmçinin əkinə yararlı torpaq sahələrinin yuxarısında, deyərdim ki, ən gözəl yerində yerləşməsi bunu söyləməyə imkan verir. Bu toponimin ilkin variantı "Araqiş" olmuşdur. Deməli, iki komponentdən ibarət olan bu mürəkkəb toponim "ara" və "qiş" sözlərindən yaranmışdır. Bu baxımdan hər iki komponentin ayrı-ayrılıqda araşdırılması daha məqsədəuyğundur. Birinci komponent olan "ara" sözü türk dillərində "orta", "mərkəz", "sərhəd" anlamındadır və bu gün də ümumtürk dilində işlənməkdədir.

Toponimin ikinci komponenti "qiş" sözünə tarixi mənbələrdə rast gəlinir və günümüzdəki, "qaş" sözünün sinonimidir. Bu söz öz əvvəlki formasını bir xeyli dəyişərək qiş/kiş/xiş/xış formasına düşmüşdür. Qədim türk dilində "qiş" sözü isə "qaş" mənasını ifadə edən omonimdir və coğrafi termin kimi "dağın, dərənin, təpənin ön, qabaq tərəfi, təpənin aşağı hissəsi" mənalarını ifadə edir.

Mənbələrin verdiyi məlumata görə, Manna ərazisində qeydə alınmış toponimlər içərisində bu tip coğrafi adlara (Bunaqiş, Babaqiş, Surikaş və s.) tez-tez rast gəlinir. Nümunə üçün Bunaqiş toponiminin izahını vermək kifayət edər. Dağ keçidinin adını bildirən toponimin birinci komponenti olan "bun" türkcə "dağlarda keçid başlayan yer", "dağ çökəyi" mənasını ifadə edir, ikinci "qiş" komponenti isə "qaş", "dağın qaşı" mənasındadır.

Göründüyü kimi, Araxış kəndi qədim tarixə malik kəndlərdən biri olmuşdur. Ərazidə olan qədim qəbiristanlıq və məzarüstü abidələr buranın qədim yaşayış məskəni olduğunu sübut edən ən yaxşı dəlillərdir. Eyni zamanda inşa tarixi məlum olmayan, araşdırılmamış, yarıuçuq şəkildə qalan qədim tikinti qalıqları olub-keçənlərin ən etibarlı şahidləridir. Ərazidə kənd təsərrüfatı işləri ilə əlaqədar aparılan təsadüfi qazıntılar zamanı müxtəlif qədim məişət və təsərrüfat əşyalarına rast gəlinirdi. Keçən əsrin 30-cu illərinin əvvəllərinə qədər yaşayışın mövcud olduğu Araxış kəndində sovet

hökumətinin apardığı kollektivləşmə siyasəti nəticəsində yaşayış ləğv edilmiş və tamamilə xarabalığa çevrilmişdir. Kəndin xarabalıqları 1950-ci illərə qədər qalsa da, yaxın kəndlərin (Kürdhacı və Ərikli) əhalisinin əkin-biçin sahəsinə çevrilən xarabalıqlar bu qalıqlardan da təmizləndi.

Kənd ərazisi hal-hazırda digər ərazilərimizlə birlikdə Ermənistan Respublikası Silahlı Qüvvələrinin işğalı altındadır və kənddə yaşayış yoxdur. Öz çirkin əməllərindən zövq alan haylar Ərikli kəndinin adını dəyişərək Araxiş (Арахиш) adlandırmaqla öz xəyallarını gerçəkləşdirməyə çalışırlar. Erməni mənbələrinin bəzilərində isə Ərikli kəndi Aşağı Ərikli kimi qeyd edilir. Bu isə onların bu tarixi ərazilərlə yaxından tanış olmamasından irəli gəlir.

**Kəndin mədəniyyəti:** Məlumdur ki, hər dövrün, zamanın, ictimai-iqtisadi formasiyanın tarixi ilə yanaşı, yaşam tərzi və mədəniyyəti onun ən etibarlı milli sərvətidir. Bu baxımdan Araxış kəndinin mədəniyyət tarixinə kiçicik bir səfər etmək tam yerinə düşərdi.

Kürdhacı kəndindən 5 km şimalda, Ərikli kəndindən təxminən 2 km cənubda yerləşən Araxış kəndinin ərazisində qədim qəbiristanlıqların və kəndin xarabalıqları, həmçinin bir yarıuçuq kilsə mövcud idi. Araxış məbədi qəzalı bir vəziyyətdə, tavanı çatma tağlarla tamamlanan günbəzli, bir nefli, mərkəz tipli bazilikası olan olduqca diqqətəlayiq və dövrünə uyğun möhtəşəm bir şəkildə inşa edilmişdir. Məbəd sovet hökuməti tərəfindən qeydiyyata götürülmüş, lakin məbədin ərazisində heç bir vaxt arxeoloji qazıntı işləri belə aparılmamışdır.

Əsas özəlliklərini müxtəlif dövrlərdə itirərək günümüzdə öz görkəminin bir hissəsini saxlayan abidə qeyri-adi memarlıq quruluşuna malikdir. Bu tip digər tikililərdən fərqli olaraq burada keşiş cübbələrinin saxlandığı yer – yəni geyinmə otağı yoxdur. Tikilinin planında bir apsidalı, nalşəkilli qurbangah diqqətəlayiq formadadır. Tikintinin inşası zamanı əsasən əllə yonulmuş, yaxşı işlənməmiş daşdan, əhəng və qum qarışığından istifadə edilmişdir. Xarici ölçüləri; 12.30x5.20 metrdir. Tikilinin ətrafında və ona yaxın ərazilərdə xristianlığa qədər və xristianlıq dövrünə aid edilən qədim qəbiristanlıq uzanır.

Divarların qalınlığı 90 santimetrə qədərdir. Kompozisiya və və konstruksiya xüsusiyyətlərinə görə XII-XIII əsrlərə aid etmək olar. Tikintinin təməlinə və hörgü üslubuna diqqətlə baxış keçirən zaman açıq-aydın görünür ki, bu tikinti daha qədim zamanlarda tikilmiş və hansısa səbəbdən uçub-dağılmış bir binanın təməli üzərində yenidən inşa edilmişdir. Məbədin qapı və pəncərələrinin yanları ustalıqla yonulmuş, hörgü daşından tam fərqli, cilalanmış daş kəmərlə hörülmüşdür.

Yaxınlıqda yerləşən qəbiristanlıqda olan məzarüstü daşlara baxış keçirən zaman yuxarıda söylənən fakt özünü tam təsdiq edir. Burada onlarla məzarüstü daşlar günümüzə qədər gəlib çatmışdır. Ərazidə mövcud olan qədim qəbir abidələri əsas tarixi abidələr sayıla bilər. Onlardan bir neçəsinin üstündə yazılar vardır. Kilsə yenidən inşa edilən zaman məzarüstü daşların bəzilərinin yeri dəyişdirilmiş, sındırılmışdır və məhv edilmişdir. Bu proses sonrakı dövrlərdə də davam etmişdir.

Laçın rayonunun ərazisində olan mədəniyyət abidələri içərisində əsasən qəbirüstü abidələrin, kurqanların, məbədlərin özünəməxsus yeri var. Təbiətin rəngarəng gözəlliyi ilə səsləşən çox nadir sənət nümunələrindən biri olan, incə zövqlə, cızma və qabartma üsulları ilə işlənmiş qəbirüstü abidələr, eləcə də başdaşları, həmçinin at və qoç fiqurları, habelə digər abidələrin bir çoxu hələ də öz forma və gözəlliyini saxlayıb. Qeyd edək ki, Laçın ərazisi atəşpərəstliyin – zərdüştlüyün yaranma məkanlarının bir parçası və mərkəzi olan Zəngəzur ərazisinə daxil olduğundan burada günəşə, ulduza, aya, oda sitayiş bu bölgədə yaranan bütün tikililərdə, əsas etibarı ilə memarlıq abidələrində öz əksini tapmışdır.

Araxış kəndinin yaxınlığındakı qəbiristanlıq ərazisində bir-birindən fərqli çox sayda qəbirüstü abidələr və onların qalıqlarına son dövrlərə qədər rast gəlmək olurdu. Bu baxımdan şose yolun aşağı hissəsində olan qədim qəbirlər və qəbirüstü abidələr diqqəti cəlb edir. Onlar xristianlıqdan əvvəlki dövrə aiddir. Hətta dəfn üslubu tam fərqli olan bu qəbiristanlıqda bir iri arxaik daş abidə əkin işləri aparılan zaman təsadüf nəticəsində üzə çıxmışdı. 220 x 68 x 30 sm ölçüdə olan bu qaya üzərinə işlənmiş rəsmdə dünyanın ən köhnə etiqadlarından biri olan Zərdüşt dininə inananlar odu, günəşi ən müqəddəs, baş ilahi və ülvi qüvvə hesab edir, odun, günəşin nuruna sitayiş etmək, qarşısında səcdə qılmaq, dua oxumaq və onun şərəfinə qurban vermək üçün kollektiv şəkildə mərasim keçirirlər. Mərasimdə Zərdüşt dininə iman gətirənlər oda, günəşə qurban olaraq heyvan (buğa və ya qoç) aparırlar.

Alban memarlığının səciyyəvi əlamətlərini özündə qoruyub saxlayan sinə və başdaşları albanlara xas olan üslubda naxışlanmış, üzərində alban xaçları işlənmiş, xristianlığa aid qədim daş abidələr özləri də müxtəlif dövrlərə aiddir. Belə ki, qəbiristanlığın ərazisində, kilsənin cənub-şimal tərəfində bu yaxınlara qədər qalan, heç bir yazısı olmayan, arxaik, iri qaya üzərində işlənmiş alban xaçı da diqqəti cəlb edir. 220 x 60 x 30 sm ölçüdə olan bu məzarüstü abidəni üslub və bədii xüsusiyyətlərinə əsasən XI-XII əsrlərə aid etmək olar. 180 x 67 x 30 sm ölçüdə olan daha bir daş abidə (xaçkar) kilsədən bir qədər aralıda, kilsənin cənub tərəfində bir kənara atılmış şəkildə

qalmaqda idi. Bu abidəni isə öz üslub və bədii xüsusiyyətlərinə əsasən XVI-XVII əsrlərə aid etmək olardı.

Məzarlığın digər bir hissəsi isə islam dininin qaydalarına əməl olunaraq dəfn edilən müsəlman qəbiristanlığıdır. Bu məzarların baş və sinədaşında ərəb qrafikası ilə yazılmış yazılar, eləcə də başdaşıların üzərindəki ay-ulduz rəsmləri çox maraqlı idi.

Araxış kəndinin maddi və mənəvi mədəniyyətinin mühüm tərkib hissəsi olan bu daş abidələrin hay əsirliyindən sonrakı taleyi haqqında bu gün dəqiq məlumatımız yoxdur.

XVIII yüzilliyin sonlarında bu ərazilərdə toxuculuğun inkişafı Araxış kəndinin mədəniyyətinə də öz təsirini göstərdi. Kənddə kustar üsulla ipliklər əldə edilir, gözəl xalça və xalça məmulatları, tikmələr hazırlanırdı. Əyirmə, toxuma, hörmə və tikmə işlərini arxaik şəkildə yerinə yetirən kənd sakinləri gözəl əl qabiliyyətinə malik olmuşlar. Demək olar ki, ailələrin əsas hissəsində toxucu dəzgah (hana və yer hanası) mövcud idi.

**Kəndin təbiəti:** Kəndin lap yaxınlığından Laçın – Kəlbəcər şosesi keçir. Murovdağın cənubunda, orta dağlıq yamaclarda, təxminən respublikanın paytaxtı Bakı şəhərindən şose yolla 508 km qərbdə, rayon mərkəzindən şose yolla 58 km şimal-qərbdə, Kiçik Qafqaz sıra dağlarında, Qarabağ yaylasının cənub-qərb yamacında yerləşən kənd Xankəndi dəmir yolu stansiyası ilə şose yolla ara məsafəsi 130 km-dir. Şamkənd kəndinin qərbində, Kürdhacı kəndinin şimalında, Muncuqlu kəndinin şərqində, Ərikli kəndinin cənubunda qərar tutan kənd meşə və düzənlik kənarında, uca dağlar qoynunda yerləşmişdir.

Ərazisi sonradan ətraf kəndlər arasında bölüşdürülən Araxış kəndinin ətrafında da çoxlu sıldırım qayalar, yamyaşıl düzənlər, dərin dar dərələr, sıx meşələr, kollu yamaclar, meşələrlə əhatələnmiş xırda göy talalar və gül-çiçəkli çəmənliklər vardır.

Kəndin ətrafındakı torpaq sahələrinin əsas hissəsinin əkinə yararlı olan düzənliklər təşkil edirdi. Meşə örtüyü ilə əhatə edilən qalan ərazilərdə palıd, ağcaqayın, göyrüş, qarağac, cökə, murdarça, cır alma, armud, alça, yemişan, qoz, qaragilə, giviş, əzgil, zoğal, fındıq, qarağat, moruq, həmərsin (itburnu və yaxud dərgil), zirinc, dovşan alması kimi ağac və kollar bitir.

Meşələrin daimi sakinləri olan ayı, vaşaq, canavar, çaqqal, tülkü, porsuq, gəlincik, cüyür (əlik), çöl donuzu, dovşan və digər heyvanlar tez-tez gözə dəyir. Meşə və düzənliklərdə qaratoyuq, bülbül, ağacdələn, şanapipik, sərçə, qartal, quzğun, qızılquş, qırğı, çobanaldadan, bildirçin, alacəhrə, alabaxta, göyərçin, qaranquş, arıquşu, qarğa, alaqarğa, cur-cur, zığ-zığ və başqa quşlar yaşayır.

Dəniz səviyyəsindən 1741 m yüksəklikdə yerləşən ərazinin florası çoxsaylı müalicəvi dərman və qeyri-müalicəvi bitkilərlə zəngin olan Araxış ərazisinin çəmənlik, həmçinin yamac və güneylərində çiyələk, çaşır, baldırğan, kəklikotu, qantəpər, qırxbuğum, qatırquyruğu, andız, quşəppəyi, kənaf, qazayağı, zəyərək, zirə, gicitkən, əvəlik, çobanyastığı, bağayarpağı, bat-bat, boymadərən və digər bitkilər bitir.

**Camaatın ictimai həyatı:** Kəndin ilkin sakinləri haqqında dəqiq məlumat olmasa da, qədimdə burada yaşayanların heç biri nə kürd, nə də erməni əsilli olmamışdır.

Araxış kəndi 1727-ci ildə Xaçın məlikliyinin tərкibində yerləşən Məğavuz nahiyəsinin кəndlərindən biri olmuş və siyahıyaalma zamanı Araxoş kimi qeyd edilmişdir. Mənbə kənddə heç kimin yaşamadığını qeyd edir. Buna səbəb isə yerli əhalinin arana-dağa, yəni yaylağa getməsi, həmçinin vergi ödəməmək üçün yaxın ərazidə daldalanmaq üçün kaha və zağaların olmasından yararlanmasıdır. Vergi toplayanların siyahıyaalması başa çatdıqdan sonra camaat geri, öz ev-eşiyinə dönərdi.

Zəngəzur mahalının Hacısamlı nahiyəsinin (indiki Laçın rayonunun) Qasımuşağı obasının (indiki Kürdhacı inzibati ərazi dairəsinin) ərazisində yerləşdiyi zaman Araxış kəndində əsasən Qasımuşağı tayfasının İbrahimuşağı tirəsi yaşamışdır. Bu tirənin ulu babası İbrahim Qasım oğlu çox cavan ikən xəstəlikdən vəfat edib. Uşaqlarının tərbiyəsi ilə İbrahimin qardaşı Molla Həsən Qasım oğlu məşğul olmuşdur.

Keçən əsrin əvvəlində o dövrün ən müasir silahları ilə silahlanmış, "Böyük Ermənistan" xülyası ilə yaşayan erməni daşnak silahlı dəstələri xalqımızı məhv etmək, torpaqlarımızı ələ keçirmək üçün Azərbaycanın bütün bölgələrinə hücuma keçdi. Digər bölgələrdən fərqli olaraq Qarabağ və onun ətraf ərazilərində erməni daşnak silahlı dəstələri məğlubiyyətə uğradıldı. Şiddətli döyüşlər zamanı kiçik dəstələr şəklində erməni qoşunları ilə qeyribərabər döyüşə girərək, Xosrov bəy və Sultan bəy qardaşlarının rəhbərliyi altında onlara ciddi zərbələr endirildi. Qaniçən erməni daşnak dəstələri tərəfindən törədilə biləcək dəhşətli qırğınların qarşısının alınması zamanı digər kəndlərdə olduğu kimi yaşından asılı olmayan Araxış kəndinin bütün başıpapaqlı kişiləri iştirak etmişdir.

Sovet hakimiyyətinin qorxulu nağıllarından biri sayılan və 1938-ci ildə yekunlaşan, şəxsiyyətə pərəstişin, təqibin, təzyiqin və repressiyanın bütün cəmiyyəti əhatə etdiyi zaman kəsiyində və istərsə də ondan sonrakı dövrlərdə gecə-gündüz qorxu və səksəkə içərisində ömür sürən, sağ-salamat yaşadığı hər gün üçün şükür edən kənd əhalisi yaşayışlarını hürkü-qorxu içərisində davam etdirirdilər.

Sovet hakimiyyətinin ilk illərindən kənd əhalisi digər kəndlərə köçürülməsi planlaşdırılsa da, xeyli müddət bu iş həyata keçirilmədi. Nəhayət, 1934-1935-ci illərdə Araxış kəndi ləğv edilmiş və əhali buradan köçürülmüşdür. Kollektivləşmə dövrünə təsadüf edən bu köçürülmənin əsas məqsədi kəndliləri nəzarətdə saxlamaq və əhalini məcburi surətdə kolxoz quruculuğuna cəlb etmək olmuşdur.

Köçürmə zamanı kənd əhalisinin müəyyən hissəsi qohumluq əlaqələri olan Bozdağan, Yuxarı Çorman, Hətəmlər, Muncuqlu, Nağdalı və digər kəndlərə köç edirlər. Kənd sakinlərinin əsas hissəsi isə Tərtər rayonunun Qaraqoyunlu (Azad Qaraqoyunlu) kəndinə köçür və orada öz həyat yollarına davam edirlər. Hal-hazırda da onların davamçıları olan İbrahimuşağı tirəsinin bir neçə qolu Qaraqoyunlu kəndində yaşamaqdadır.

**Əhalinin məşğuliyyəti:** Kəndin yerləşdiyi ərazinin torpağı çox məhsuldar və bərəkətli, taxılçılıq, meyvəçilik, heyvandarlıq üçün xüsusilə yararlı idi. Yem, dənli, eləcə də texniki bitkilərin yetişdirilməsi üçün əlverişli şəraiti olan bu ərazilərdə becərmə işləri əsasən dəmyə aparılırdı. Orta illik temperaturun 01°C ilə 08°C arasında dəyişməsi və yağıntının illik miqdarının 700-800 mm-ə qədər olması dəmyə əkinçilik üçün əlverişli şərait yaradırdı. Əkinə yararlı sahələrdə buğda, arpa, vələmir, darı, pərinc, çovdar, qarğıdalı və başqa dənli bitkilər, eləcə də çoxillik yem bitkiləri becərilirdi. Əkinçilik kəndin iqtisadiyyatında əsas yeri tuturdu. Bununla yanaşı heyvandarlığın inkişafı üçün təbii ot biçənəkləri üstünlük təşkil edirdi. Heyvandarlıqla məşğul olan kənd əhalisinin müəyyən hissəsi yaz gələr-gəlməz Qırxqıza, yaylağa köç edərdilər. Payız fəslinin soyuq günləri özünü göstərər-göstərməz əhali yaylaqdan geri dönərdi.

Əsas sahəni kənd təsərrüfatı tutsa da, burada qoyunçuluğun inkişafı ilə əlaqədar toxuculuq və tikişçilik sənəti də əhalinin məşğuliyyət növlərindən biri idi. Dədə-babadan qalma məşğuliyyətləri olan toxuculuq üçün demək olar ki, hər bir ailədə toxuculuq alətləri (əsasən də divar və yer hanası) var idi.

Müxtəlif dövrlərdə kənd təsərrüfatı məhsullarının istehsalı da kənd əhalisinin məşğuliyyətlərinin əsasını təşkil edir. Həmçinin meşədə bitən cır meyvə və giləmeyvələr əhali tərəfindən toplanır, onlardan meyvə qurusu (qax) hazırlanır, müxtəlif məqsədlər üçün istifadə edilərdi.

Ərazidə yaşıl çəmənlərin, çiçəkli güneylərin olması arıçılığın, sıx meşələr olması ovçuluğun, dülgər və xarrat işlərinin, taxta-şalban və kömür istehsalının, eləcə də ərazidə əhəng istehsalına yararlı Laçın əhəng daşı ilə zəngin olması əhəng daşı yandırılmasının inkişafına öz təsirini göstərirdi.

Özlərinin maddi vəziyyətlərini yaxşılaşdırmaq, ehtiyaclarını ödəmək üçün kənd camaatı saxladığı heyvanları, hazır məhsulları (heyvandarlıq məhsulları, arıçılıq məhsulları, xalça məmulatlarını), məişət əşyalarını yaxınlıqdakı və aran zonasındakı bazarlara çıxarar, ehtiyac duyulan ərzaq, təsərrüfat və sənaye mallarına dəyişdirər, yaxud da nağd pula satardı. 1905-1907-ci il hadisələrinə qədər belə məhsulları Qərbi Azərbaycanın Gorus və Qarakilsə bazarlarına da çıxarardılar.

İqlimi yayda sərin, olduqca səfalı, qışda isə sərt olan bu ərazilərdə qış 5, bəzən 6 ay sürərdi.

Kənd ərazisinin peyk vasitəsilə çəkilmiş son dövrünə aid fotoşəkillər onu göstərir ki, işğaldan sonra ətraf kəndlərdə məskunlaşmış xeyli sayda erməni ailəsi kəndə aid ərazilərdə təsərrüfat fəaliyyəti ilə məşğuldur.

Ulu babalarımızın bizə miras qoyduğu maddi-mənəvi irsi qoruyaraq gələcək nəsillərə çatdırması hər birimizin borcudur. Amma uzun illər orada yaşamağımıza baxmayaraq, səhlənkarlığımız və zəifliyimiz nəticəsində demək olar ki, bunu bacarmadıq.

Bizlərə ən müqəddəs əmanət olan ata-baba yurdumuzu bu dəfə düşmənlərimizdən qoruya bilmədik və nəticədə yeni bir ad aldıq: "Məcburi köçkün!" Talelərə yazılan bu adı özlərinə rəva bilənlər də tapıldı. Amma yüzlərlə soydaşımızın bu dünyadan Qarabağ nisgili, yurd həsrəti ilə köçməsi isə bu gün qəlbimizi göynədən çox ağır bir dərddir. Hələ də qəbul edə bilmədiyimiz bu ad, çiynimizdə, qəlbimizdə daşıdığımız bu dərd bizim ən ağır yükümüzdür.



Böyüklü-kiçikli hər kəsin qəlbində bir arzu, bir inam var – yurd həsrəti ilə yanaşı bitib-tükənməyən yurda qayıtmaq inamı. Yəqin ki, gün gələcək, bu arzumuz çin olacaq! Nə bilim...

**Sultan HÜMBƏTOV,**
***tədqiqatçı***

**NƏSR**

## AMİNAL

***Bu hekayənin süjet xətti Laçının məşhur kəndlərindən birində baş vermiş hadisədən götürülüb.***

Dağlar bəyaz rəngə bürünmüşdü. Kiçik təpələr ağ qardan papaq geyinmişdi. Kənddən bir az aralı, üzü meşəyə sarı gedən ensiz cığırların qar örtmüş sinəsində tülkü, canavar, çaqqal və dovşan rədləri bir-birinə qarışmışdı.

Dağətəyi kəndin evlərindən çıxan tüstülər səmaya çatmaq üçün sanki bir-biri ilə yarışırdı.

Bu kəndin evləri bir-birinə yaxın tikilmişdi. Ancaq dərəyə tərəf tikilmiş aynabəndli, eyvanlı tək bir ev var idi ki, kənardan kəndi seyr edən adamda qəribə bir təəssürat oyadırdı. Sanki dağların arxasındakı "əsirliyindən" can qurtarmış külək bu obadan yalnız və yalnız bu evi qabağına qatıb dərənin kənarına qədər sürükləmişdi.

Aynabəndli, eyvanlı evin eyvana çıxan qalın, taxta qapısı zərblə açıldı. Əli silahlı Mürvət kişi qapını eyni zərblə örtərək pilləkənləri enməyə başladı. Pilləkənin qurtaracağında ayağını qarın üstünə qoyan Mürvət kişi sanki pambıq təpəsinin üstünə çıxırmış kimi yumşaq bir boşluğa düşdü. Pilləkənin yanından sola burulan kişi əsəbi halda dodaqaltı nə barədəsə deyinirdi. O, balaca ot tayasının yanına çatanda duruxdu. Tələm-tələsik ətrafı süzməyə başladı. Deyəsən kişi nəzərləri ilə nəyi isə axtarırdı.

Qəflətən ot tayasının arxasından çıxan it sahibini görən kimi səliqə ilə qatladığı quyruğunu yellətməyə başladı.

Bu mənzərəni görən Mürvət kişi səsini qaldırdı və itin qarasına danışmağa başladı: – Bunun özünə bax, sonra da mənə quyruq bulamağına bax. Hər yetənə quyruq sallayırsan ki, qapıdan odun qurtarır da! Atamın goru üçün bu qoşalülə tüfəngin güllələrini təpənə dolduracam.

Bunu deyən Mürvət kişi əsəbi halda tüfəngi "üzünə" alıb tətiyi çəkdi. Ala it tək bircə dəfə zingildədi. Böyrü üstə aşan itin qanı ağ qarı al rəngə boyadı.

Güllə səsinə eşiyə çıxmış Tükəz arvad eyvandan baxanda əli silahlı ərini, bir də bədənindən hələ də qan axan ala itin yerə sərilmiş leşini gördü. O, nə baş verdiyini anlamışdı.

– Allah, sən saxla! Səhər tezdən xalx xeyir bir iş görür ki, günü xeyirli olsun, bizimki də qapısının heyvanını öldürür, – deyən Tükəz arvad ərinin qarasına deyindi.

Hələ də əsəbi olan Mürvət kişi arvada acıqlandı:

– Nə var az! Səhərin gözü açılmamışdan səsi kal çolpa kimi nə banlayırsan. İt mənim deyil?! Öldürərəm də özüm bilərəm, öldürmərəm də özüm bilərəm. Mana ağıl öyrədənə bax! Xalx it saxlıyır ki, həyət-bacanı qorusun, yiyəsinə hayan olsun, bu başı batmış da hər gördüyünə quyruq bulayırdı. Özün də ki, kənarda dayanıb əmr verən kolxoz sədrləri kimi başımın üstünü kəsdirmə. Gəl bu leşin bir tərəfindən də sən tut, aparıb tullayaq dərəyə.

Arvad gülümsündü:

– Deyəsən ağlın gedib axı! Bilmirsən ki, iti öldürənə sürütdürürlər! – Bunu deyən Tükəz arvad yenidən içəri girdi.

İti öldürməyinə baxmayaraq, hələ də əsəbi olan kişi arvadı dalınca çəmkirdi: – Zalımın qızı elə bil "söz dağarcığıdır". Birin deyirsən, beşin deyir!

Mürvət kişinin iti güllələməsindən bir həftə ötmüşdü. Amma yenə də axşamdan sobaya qoymaq üçün doğradığı odunları kimsə daşıyırdı.

Tükəz arvad bu dəfə dözə bilməyib kişini öz iynəli atmacaları ilə sancdı:

– Mürvət, iti güllələdin ki, qapı-bacanı yaxşı qorumur. Hamıya quyruq bulayır. Yaxşı, indi günahı kimin boynuna yıxacaqsan?

Sobanın yanında salınmış ocaqqırağı döşəyin üstündə uzanıb yastığa dirsəklənmiş Mürvət kişi arvadın bu iynəli atmacasından sonra yaşına uymayan bir cəldliklə durub oturdu. Əsəbindən dodaqları səyridi.

– Ay sümüyü...! Yoxey, dədənə söymürəm. Sənin dədən ivhallı adamdı, – deyən Mürvət kişi hövsələsini basıb sözünə davam etdi: – Ay xalasına oxşar, mana söz atırsan?

Ərinin bu sözündən sonra özünü saxlaya bilməyən Tükəz arvad dördayağın üstündəki xəngəl yarpaqlarını əlinin dalı ilə itələyib unlu əllərini havada qəzəblə yellədi:

– Mənim mələk kimi xalama lağ eləyirsən a çal öküz? Nəslinin bütün yaylıq bağlayanları xalamın bir teli də ola bilməz.

– Düz deyirsən. Mənim cəmi nəslimdə xalan sifətdə adam tapılmaz. O qədər deyindi ki, axırda buz baltası kimi əri də dözməyib öldü. Xalanı mənə tanıtdırırsan?

– Səni danışdırmaq xatadı. Başlıyanda kəsmirsən, – deyən Tükəz arvad çölə çıxdı.

Arvadın arxasınca baxan Mürvət kişi: – Xatirləri də yaman əzizdir zalım qızlarının. Söz tez dəyir, – dedi. Bir az pəncərəyə tərəf baxdıqdan sonra öz-özü ilə danışmağa başladı: – Bir aydır ki, məni dəli eləyib. Qoca vaxtımda min əzab-əziyyətlə odun gətirirəm, səhər baxıb görürəm ki, yarılıyıb. Elə bil dədəsiynən şərikli malımız var. Onun ucbatından arvad-uşağın da dilinin oyuncağı olmuşam. Hər kimdirsə bu axşam dədəsinə od qoyacam.

Axşamtərəfi xeyli odun doğruyan Mürvət kişi sobanın ölçüsünə doğradığı odunları səliqə ilə bir-birinin üstünə yığdı. Sonra baltanı əl-ayaq damına aparıb qoyanda damın bir küncündə gizlətdiyi aminal kapsulunu da ehmalca özü ilə götürdü.

Evə gedərkən aminal kapsulunu özü ilə aparan Mürvət kişi səliqə ilə yığdığı odunlardan birini əlinə alıb pilləkənləri qalxmağa başladı.

Sobanın qırağına yaxın oturmuş Mürvət kişi əlindəki odunun səliqə ilə kəsilmiş dairəvi kəlləsində uzun bir oyuq açmışdı.

Ərinin bu qəribə hərəkətini izləyən Tükəz arvad dedi: – Ay rəhmətliyin oğlu, axşamın bu dar vaxtında nə iş görürsən?

– Arvad, çoxdandır kənddə maraqlı bir hadisə olmur. İstəyirəm ki, bu axşam bir az səs eləyəm. Sən nə deyirsən?

– Qoca vaxtında deyəsən ağlın yayınıb axı?

– Düz deyirsən! Ağlım əməlli-başlı yayınıb. Bu yayınmış ağlımla bu axşam biləcəm ki, bir aydır mənim qapımdan odunları daşıyan hansı kopoyoğludur.

Mürvət kişi səliqə ilə aminal kapsulunu odunun kəlləsində açdığı oyuğa yerləşdirdi. Sonra əvvəlcədən yapışqanladığı odun qırığını oyuğun kəlləsinə qoyub bərkidiyinə tam arxayın olandan sonra içərisində kapsul olan odunu aparıb həyətdəki odunların arasına qoydu.

Səfqulu bir aya yaxın idi ki, dadanmışdı Mürvət kişinin odunlarına. Boş yerə demirlər ki, dadanan qudurandan pis olur. Kolxoz heyvanlarının naxırçılarından biri olan Səfqulu Mürvət kişinin evi ilə qabaq-qənşər, dərənin o biri tayındakı kolxoz tövlələrindən evinə həmişə gec qayıdardı. Mal-qaranı rahatlayıb evə gedəndə artıq gecədən xeyli keçmiş olurdu. Bu səbəbdən də evində soba üçün odun doğraya bilməyən Səfqulu hər axşam evi yolunun üstündə olan Mürvət kişinin həyətinə girər, doğranmış odunlardan götürə bildiyi qədər yığıb apardı.

Həyətdəki ala it Səfquluya ona görə dəyməzdi ki, o hər dəfə işə gedəndə itə evdən götürdüyü çörək qırığından, sür-sümükdən atardı. İt ilə dostlaşan odun oğrusu bu səbəbdən işini arxayın, səssiz-səmirsiz görürdü.

Səfqulu yenə işdən gec qayıdırdı. Mürvət kişinin evinin yanına çatanda həmişəki kimi ayaq saxlayıb ətrafı diqqətlə yoxladı. Amma bir şey onun diqqətini cəlb etdi.

– Gecə saat on ikiyə işləyir, bu qocalar niyə yatmayıb görəsən? Bəlkə mənim onların odununu daşıdığımı biliblər? Mənim ucbatımdan Mürvət kişi iti də güllələyib öldürdü. Leşini dərəyə tullayanda özüm gördüm. Bəlkə artıq duyuq düşüblər? Yox! Mən Mürvət kişini yaxşı tanıyıram. Əgər bilsəydi ki, odunları aparan mənəm, çoxdan belimi qırmışdı, – beynində bu fikirləri

dolandıran Səfqulu yenə də ehmalca çəpərdən aşıb həyətə girdi. Qucağına apara biləcəyi qədər odun yığıb tez-tələsik həyətdən çıxdı.

Evə çatan kimi odunların yarısını dəhlizə qoyan Səfqulu əlinə iki odun aldı ki, sobaya atsın. Odunları sobaya qoyandan sonra rahat bir şəkildə soyunub yatağına girdi.

Yuxusu gözlərindən tökülən Tükəz arvad sobanın üstündə isitdiyi çörəyin arasına motal pendiri qoyub dürmək edərək iştahla yeyən ərinə dedi:

– Mürvət, gecə keçir axı. Dur yataq.

– Arvad, sən ölənlərinin goru mənim fikrimi yayındırma. Yatmaq istəyirsənsə get yat. Mən hələ əməlimin nəticəsini görüb sonra yatacam.

Söz Mürvət kişinin ağzından yenicə qurtarmışdı ki, kəndin yuxarısında sanki bomba atıldı.

Səsdən diksinən Tükəz arvad:

– Mürvət, o nə gurultu idi elə? – dedi.

– Arvad, əməlimin nəticəsi idi də. Mən bayaqdan bunu gözləmirəm bə. Dur gedək başımızı ataq yataq.

Səfqulunun evinə sanki bomba düşmüşdü. Bütün pəncərələrin şüşələri sınmış, qapılar yerindən oynamışdı.

Xoşbəxtçilik onda olmuşdu ki, evin sakinlərinə xətər dəyməmişdi. Elə buna görə də Səfqulu ürəyində tez-tez deyirdi: – Allah, sənə çox şükür! Mənim tənbəlliyimin və artıq tamahlılığımın ucundan külfət qırılacaqdı.

Amma bu hadisəni eşidən kənd sakinləri bilmədilər ki, Səfqulunun evi hansı səbəbdən müharibə meydanına dönüb.

Bu məsələni bir Mürvət kişi bilirdi, bir də ki, Səfqulu. Ancaq Səfqulu bir şeyi bilmirdi ki, evinin altını üstünə gətirən partlayıcı hansı növdəndir?!

Bu maraqlı və təhlükəli təhlükəsizlik tədbirindən sonra Mürvət kişinin odunlarına dəyib-toxunan olmadı.

**Halay NADİROV**

**YUBİLEY**



## 50 YAŞ – GƏNCLİYİN MÜDRİKLİYİ, MÜDRİKLİYİN GƏNCLİYİ

Dostum Xalid Nəcəfovun 50 illik yubileyinə çoxdan hazırlaşırdım. Hazırlaşırdım deyəndə, hansısa hədiyyə-filan alacağımı deyil, özümü bir yubiley təbriki yazmağa köklədiyimi nəzərdə tuturam. Əslində elə ən çətini də bu imiş. Düz 2 ay nədən başlamaq haqqında götür-qoy etsəm də, yazının "qızıl giriş"ini tapa bilmədim. Nəhayət, anladım ki – Bəlkə də başqa çıxış yolum qalmadı – dünyada deyilməmiş söz yoxdur. Sadəcə olaraq, min illər boyu deyilən sözlər hər dəfə təkrarlandıqca öz ruhunu təzələyir və bizlərə yeni görünür. Yubiley tədbirinə 2 gün qalmış bu "sübut"dan bərk-bərk yapışaraq qələm-kağız götürəndə köməyimə yenə də Xalidin özü çatdı. Daha doğrusu, atası Bahadur Nəcəfovun 80 illik yubileyinə həsr etdiyi "Xatirələrdə yaşayan ziyalı" kitabı bələdçim oldu. O, həmin kitabda özünə ideal seçdiyi, həmişə qürur duyduğu atası haqqında yazırdı: "Ləyaqətli və həqiqəti üzə deyən bir insan kimi xatırlanan Bahadur müəllim Vətənini, torpağını sevən, dostluqda mərd, sədaqətli, yoldaşlıqda səxavətli, qohumluqda təəssübkeş, işində çox məsuliyyətli, sözündə dürüst bir şəxs idi".

Bu kiçik sitatda deyilənləri heç bir tərəddüdsüz Xalidin özünə də aid edərək onun bioqrafiyasını vərəqlədim.

Xalid Bahadur oğlu Nəcəfov 8 iyun 1967-ci ildə Azərbaycanımızın dilbər guşələrindən olan Laçın rayonunun Pircahan kəndində müəllim ailəsində dünyaya göz açıb. Pircahan kənd orta məktəbində birinci sinfə gedib. İbtidai sinif müəllimi öz gözəl insani xüsusiyyətləri ilə heç vaxt yadından çıxmayan Paket müəllimə olub. Həmişə əla qiymətlərlə oxuyub. Atasının işi ilə əlaqədar Bakı şəhərinə köçdükdən sonra təhsilini Bakı şəhərindəki 182 saylı orta məktəbdə davam etdirib. Məktəbin ictimai-təşkilati işlərində fəallıq göstərib, olimpiada yarışlarında ön sıralarda yer tutub. Eyni zamanda "Dinamo" İdman Cəmiyyətində sərbəst güləş idman növü ilə də məşğul olub, bu sahədə də təltif və diplomları var. 1985-ci ildə 182 saylı orta məktəbi fərqlənmə ilə başa vurub. Amma ali məktəbə gedən yolu hamar olmayıb. İstəyinə çatanacan çox çətinliklərdən keçib. Əmək fəaliyyətinə həmin ilin avqust ayında Bakı Ayaqqabı Tikiş Fabrikində başlayıb. Bir neçə ay

sonra, yəni noyabr ayının 5-də Sovet Ordusu sıralarında xidmətə çağırılıb. Hərbi xidmətini sovet dövlətinin şimal sərhədində, Kareliya Muxtar Respublikası ilə Finlandiya arasında olan hərbi havadan müdafiə sistemində çavuş kimi, bölmə komandiri olaraq çox yüksək səviyyədə yerinə yetirib.

1987-ci ildə hərbi xidmətini yüksək səviyyədə başa vuraraq Bakıya qayıdıb. Bir müddət əvvəlki iş yerində çalışıb. 1991-ci ildə daxili işlər orqanında xidmətə başlayıb. Həmin vaxtlar yenidən müstəqillik yolunda ilk addımlarını atan Azərbaycan ağır günlərini yaşayırdı. Daxili işlər orqanı tərəfindən bir neçə dəfə ezam olunaraq 1992-1993-cü illərdə torpaqlarımız uğrunda gedən döyüşlərin, aparılan əməliyyatların iştirakçısı olub. Ancaq yenə də təhsilini davam etdirmək məqsədi ilə sənədlərini Bakı Dövlət Universitetinin hüquq fakültəsinə təqdim edib. İmtahanları uğurla versə də (“yaxşı”, “yaxşı” və “məqbul” qiymətlərlə), müsabiqədən (konkursdan) keçə bilməyib... Sənədlərini götürərək Rusiya dövlətinə üz tutub və 1994-cü ildə müvəffəqiyyətlə imtahan verərək ali məktəbə qəbul olub. 1999-cu ildə ali təhsilini müvəffəqiyyətlə başa vuraraq ilkin olaraq notariusda və sonra məhkəmə orqanında xidmətini davam etdirib.

2004-cü ildə Rusiya vətəndaşlığının qəbulu və Azərbaycan vətəndaşlığından imtina məsələsi bir şərt kimi irəli sürüləndə tərəddüd etmədən Azərbaycana – vətənə qayıdıb. Uzun müddət işsiz qalsa da, 2007-ci il uğurlu olub. Yolların layihələndirilməsi işində, xarici məsləhətçi şirkətdə işə düzəlib. Layiqli bir kollektivdə çalışdığına görə indi də fəxarət hissi keçirir. 9 xarici şirkətin sertifikatları işinin davamlı uğurlarına daxildir. Bu sahədə də təhsilini mükəmməlləşdirmək üçün ixtisasa uyğun ikinci ali təhsil kimi Memarlıq və İnşaat Mühəndisləri Universitetini də uğurla bitirib. Hal-hazırda dədə-babadan xeyirxah iş hesab olunan yolların çəkilməsi, layihələndirilməsi və həyata keçirilməsi işində gözəl bir kollektivdə çalışır.

Bu işlərlə bərabər həyatının müəyyən hissəsində gündəliklərin yazılması, tarixi hadisələri, tarixi şəcərə haqqında məlumatların toplanaraq qeydə alınması və onların mətbu dərgilərdə çap olunmasını həyata keçirir. Bütün bunlar onun yaradıcılıq işlərinə daxil olan kiçicik bir həyat arxividir.

“Yarım əsrlik ömrümdə əsaslı məna kəsb edən qızım 9 yaşlı Rəvanə mənim həyatımın nur dünyasıdır, Tanrımın mənə bəxş etdiyi yeganə övlad payıdır. O dünya ki, onunla bütün təlatümlü məqam öz axarına yönəlir. Allah bütün balaları hifz etsin! Onların behişt ətri həyatımızın ən gözəl qoxusu kimi ruhumuzu qidalandırsın!” – deyir Xalid Nəcəfov.

Fərqindəyəm ki, yubilyarın ömür səhifələrini vərəqləyərkən kiçik məqamlara toxunmaqla kifayətləndim. Necə deyərlər, tanıtım məqsədilə ənə-

nələrə söykənən "ümumi qəlib"dən kənara çıxmadım. Həm də rəsmi rəqəmlərin, standart cümlələrin nüvəsində gizlənən daha dərin qatlara enmək üçün kiçik bir təbrik yazısının yetərli olmadığını düşündüm. Bircə onu əlavə edim ki, Xalid çoxlarına nəsib olmayan gözəl bir missiyanın daşıyıcısıdır. Dədə-baba dostluğunun köhnə kişilərə məxsus sadiqliklə davam etdirilməsi elə bil boyuna biçilib. Onun bu dostluğa hüdudsuz vurğunluğunu görəndə nə vaxtsa yaddaşıma köçən şeirin misralarını xatırlayıram:

*...Nədənsə, ay ata, sən tutan dostlar*
*Mən tutan dostlardan etibarlıdı.*

Tam əminliklə deyə bilərəm ki, Xalidə ulularından miras qalan dostluq etalonunu özündən sonra gələn gənc nəsil də eyni sədaqətlə qoruyub saxlayacaq. Axı "Ot kökü üstündə bitər" deyimi təsadüfən yaranmayıb. Bu gün ata babası Teymur kişi, ana babası Hüseyn kişi haqqında danışmaqdan doymayan, elinə-obasına sonsuz məhəbbəti ilə seçilən Xalid Nəcəfov onu yaxından tanıyanların sevimlisidir.

Yol çəkmək kimi xeyirxah bir işlə məşğul olan Xalid insanların ürəyinə də asanlıqla yol tapır. Kiçik bir ünsiyyət bəs edər ki, onu bircə dəfə görənlər həyatları boyu unutmasınlar. Bu da Allahın sevimli bəndəsinə bir lütfüdür. Bir neçə dil bilən Xalidin ən yaxşı bildiyi dil isə insanlığın dilidir. Bir də hər yaşın öz dilini gözəl bilir. Ona görə də uşaqla uşaq, böyüklə böyük, müdriklə müdrik dilində danışmağı əla bacarır. İllərin sınağından da uğurla çıxaraq ömrünün 50 yaşına çatıb. 50 yaş yubiley yaşlarının ilkidir, həm də bir zirvədir. Geriyə boylananda xatirələr, irəliyə baxanda yeni zirvələr görünür...

Gəncliyinin müdrikliyi, müdrikliyinin gəncliyi – 50 yaşın mübarək, əziz dost!

*Hörmətlə:* **Arif MƏMMƏDLİ**

**P.S. 50+1 yaşın mübarək!**

**POEZİYA**

**Yaşar BALAŞ**



## QƏZƏL

Ya Mədət, ey əzəl dərgah, ey son qərar sahibi,
Ya Mədət, ey müqəddərat, ey ixtiyar sahibi.

Hökm, sərəncam sənindir, adil də, qadir də sən,
Ya Mədət, ey ədalət, ey kəramət, kar sahibi.

Ey ərzi idrak edən, həyat bəxş edən bəşərə,
Ya Mədət, ey əbədiyyət yaradan var sahibi.

Sirri sirdaş, dostu dost satır, əcəb tərəddüdsüz,
Ya Mədət, ey tək olan ilqar, etibar sahibi.

Nəzər kəsib ömür bağımı xəzana döndərib,
Ya Mədət, ey fitrətindən bağ salan bar sahibi.

Səcdəgahsan, qibləgahsan ey mərhəmət lütf edən,
Ya Mədət, ey mahir olan ölçü-meyar sahibi.

Yaşar Balaşın abrı-həyasıdır sığındığı,
Ya Mədət, ey üzlərə ismət verən ar sahibi.

**ƏDƏBİ DÜŞÜNCƏLƏR**

## SARI AŞIQ ÜMMANINDAN DAMLALAR



...Bir aşiq yaşayıb ellərimizdə. Nakam eşqi ilə sevgi ilahisinə çevrilib. Sevən aşiqlərin inanc yeri, əhdü-peyman mücəssəməsi olubdur. Sağlığında “Sarı Aşıq və Yaxşı” dastanı yarandı və əsrlər boyu dillər əzbəri olub nəsillərin estafeti kimi bu günümüzə qədər yaşayıb, hələ əsrlərlə yaşayacaqdır.

...Bir aşıq yaşayıb ellərimizdə. Adına Sarı Aşıq deyiblər. Ədalətin, düzgünlüyün, inamın, xeyirxahlığın, nəsihətvarlığın bədii təsviri kimi bayatı janrının yaradıcısı olmaqla ədəbiyyat tariximizdə əbədiləşmiş haqq aşığı olmuşdur.

...Bir vətənpərvər, yurdsevər insan yaşamışdır ellərimizdə. Həyatının təhlükədə olmasından qorxmayaraq doğma Həkərisini, Qaradağlısını, Güləbirdini, Maxsutlusunu xan saraylarından üstün tutaraq yenə bu yurd yerlərinə qayıdaraq son nəfəsinəcən doğma obasında yaşamış və əbədiyyətə qovuşmuşdur.

Azərbaycan ədəbiyyatında Sarı Aşıq bayatı janrının ən yüksək zirvəsini fəth etmişdir. O, fəlsəfi məzmunlu əsərləri ilə korifey sənətkar statusu qazanmaqla üç əsrdən çox bir dövrdə o zirvədə yaşamaqdadır. Tədqiqatçıların

sübut etdiyi kimi Sarı Aşıq İran Qaradağlısından köç edərək indiki Laçın rayonunun Güləbird kəndi ərazisində məskən salmış türk tayfasından olmuşdur. XIX əsrdə yaşamış Qaradağı "Təzkireyi-Qaradağı" əsərində yazmışdır: "Sarı Aşıq Qaradağ mahalındandır. Çox qədim vaxtlarda gəlib Qaradağın Zəngəzur mahalında Həkəri çayının kənarında vaqe Güləbürt adlı qəryədə sükna edib". Sarı Aşığın bir bayatısı da bunu sübut edir:

*Mən Aşıq, ağ zindəyəm,*
*Selavın ağzındayam.*
*Yurdum Qaradağlıdır,*
*Məzməzək ağzındayam.*

Bunlar Sarı Aşığın digər bölgələrdən olması fikrini alt-üst edir. Əslində sufi təriqət başçısı Seyid Həmzə Nigarının də əslən Qaradağlıdan (Güləbird Qaradağlısı) olması da sübhəsizdir. Sarı Aşığın bayatılarını Salman Mümtaz, Məmməd Hüseyn Təhmasib, Əhliman Axundov müxtəlif illərdə tədqiq etmiş, kitab halında çap etdirərək xalqa ərməğan etmişlər. Sonuncu dəfə elimizin şair oğlu Hüseyn Kürdoğlu Sarı Aşığın yaradıcılığından bəhs edən kitabı nəşr etdirmişdir. Bu cür insanların əməyini illər sonrası yalnız minnətdarlıqla xatırlayırıq.

Sarı Aşığın uşaqlığı, gəncliyi, ahıllıq dövrü bu yerlərdə keçmişdir. Onun hər bir bayatısının, bağlamasının yaranma şəraiti vardır. Əsərlərindən göründüyü kimi o yaşadığı yerlərin təbii gözəlliklərini dünyada hər şeydən üstün tutmuşdur. Onun ilahi sevgilisi Yaxşı Güləbird kəndi ilə üzbəüz Həkəri çayının sol sahilində yerləşən Maxsutlu kəndində yaşayıb. Onların uğursuz məhəbbəti dillər əzbəri olan "Sarı Aşıq və Yaxşı" dastanını yaratmış, xalqın yaddaşına hoparaq nəsildən-nəslə ötürülmüşdür. Maxsutlu kəndinin ağsaqqalları və ağbirçəkləri söyləyirdilər ki, Yaxşının adı ilə bağlı yer-yurd adları son dövrlərə qədər yaddaşlarda yaşayırdı: Yaxşının bulağı, Yaxşının bağı, Yaxşının kahası və s.

Yaxşı dünyasını dəyişdikdə onu Həkəri çayının lap yaxınlığındakı düzənlikdə dəfn edirlər. Onun adı ilə Yaxşının qəbri ümumxalq ziyarətgahına çevrilir. İl boyu Azərbaycanın bölgələrindən, Gürcüstandan, Orta Asiyadan turistlər bu abidələri ziyarət edirdilər. Sarı Aşığın məşhur "Yaxşını qibləsinə, Aşığı tərsinə qoy" vəsiyyətinə əsasən onu Yaxşı ilə üz-üzə dəfn edirlər. Sarı Aşıq bu vəsiyyəti ilə sevgi nümunəsi, haqq aşığı olduğunu, bu işdə adət-ənənələrin gücsüz olduğu fikrini təlqin etməklə bəşəri məhəbbət obrazını əbədiyyətə qovuşdurur. Xalq öz aşiq və məşuqunu unutmamış, onların abidələrini tarixiləşdirmişdir.

...1989-cu ilin payızı idi. Respublikanın ədəbi mühitində bir canlanma var idi. Ədəbi ictimaiyyət ucqar Güləbird kəndində böyük söz ustadı, fəlsəfi-bayatı janrının banisi Sarı Aşıq ziyarətgahının və Bayatı Muzeyinin açılışına gəlmişdilər. Açılışlar Laçında – Güləbird kəndində bayram şənliyinə çevrildi. Tədbirlərə Bakıdan və respublikanın müxtəlif rayonlarından sənətsevərlər gəlmişdi. Xəlil Rza Ulutürk, Söhrab Tahir, Hüseyn Kürdoğlu, Şamil Dəlidağ, Səbahəddin Eloğlu, Şamo Arif, Mirəli Seyidov, İsrafil Abbasov, Akif Hüseynov, Bəhlul Abdullayev, Mürsəl Həkimovun çıxışları tarixi hadisə kimi bu gün də yaddaşlarda yaşayır. Böyük muğam ustası, müğənni Şahmalı Kürdoğlunun, "Aşıq Pəri" məclisinin konsertləri dinləyiciləri valeh etmişdi. Ziyarətgahda Sarı Aşığın məzarına bitişik olan Sultanbud türbəsi də təmir edilmiş, içərisində Bayatı Muzeyi açılmışdır. O dövrdə ziyarətgahın ətrafındakı parkda əkilmiş ağac və güllərə Güləbird orta məktəbinin müəllim və şagirdləri qulluq edirdilər və qısa zamanda burada bir yaşıl xiyaban yaradılmışdır.

Mən o dövrdə məktəbdə təşkilatçı müəllim işləyirdim. Tez-tez "Laçın" qəzetinin səhifələrində Sarı Aşığın irsindən işıq üzü görməyən nümunələri çap etdirirdim. Sonralar bu bayatıların bir qismi və atam Əliqulu müəllimin söylədikləri bayatı və rəvayətlər Azərbaycan Folklor Antologiyasının 12-ci cildində (2005) və "Qarabağ: Folklor da bir tarixdir" (2013) kitabında çap olunmuşdur. İllərin çoxillik ayrıcından sonra o bayatıların bir neçəsinin yaranması haqqında "Laçın yurdu"nun oxucularına danışmaq istəyirəm.

...Belə söyləyirlər ki bir gün Şuşa xanı Sarı Aşığı saraya çağırıb onunla tanış olmaq istəyir. O, yasavulu çağırıb göstəriş verir: Zəngəzur bölgəsinin Qaradağlı obasında bir məşhur haqq aşığı yaşayır. Adına Sarı Aşıq deyirlər. Atla gedib onu gətirərsən saraya. Deyərsən ki, xan səni qonaq çağırır. Xanın bu tələbi haqq aşığına agah olur. O özü üçün yol ehtiyatı götürərək tanış yolla Şuşaya doğru hərəkət edir. Yasavul da Şuşadan atla yola düşür. Onlar yolun müəyyən hissəsində rastlaşırlar. Yekəxana yasavul salamsız-kəlamsız Sarı Aşığın harada olmasını soruşur. Aşıq ona "tanı mənəm, bil mənəm" söyləyir. Yasavul onu başa düşmür elə bilir ki, yolçu onu təhqir edir. Sarı Aşıq yenə həmin kəlmələri deyir. Yasavul isə ona bir şallaq vuraraq aralaşır. Aşıq haqq aşığı kimi qəlbini dolandırıb bir bayatı söyləyir:

*Aşığam, sadağa ver,*
*Hirsinə qadağa ver.*
*Burdan salamat keçsən*
*Bir ye, beş sadağa ver.*

Yasavul uzaq gedə bilmir. Atın ayaqları çalaya düşərək onu yerə çırpır. O bərk yaralanır və səhvini başa düşür, haqq aşığından üzr istəyir. Onlar birlikdə saraya gedirlər. Orada xanın çoxsaylı sınaqları başlayır. Sarı Aşıq bütün sınaqlardan uğurla çıxır. Onun bu qabiliyyəti xanın çox xoşuna gəlir. O belə qərara gəlir ki, Sarı Aşığı sarayda saxlasın. Sarı Aşıq xanın təklifi ilə razılaşmır. Uzun mübahisələrdən sonra Aşıq xana deyir:

*Mən Aşığam, ha Kərim,*
*Yetiş dada, ha Kərim.*
*Gen dünya sənin olsun,*
*Mənə bəsdi Həkərim.*

Sarı Aşığın cavabı xanı yumşaldır, ona ənam verərək öz yurduna yola salır. Məşhur "tanı mənəm, bil mənəm" deyiminin yaranması belə olmuşdur.

Bir gün Sarı Aşıq taxıl zəmisindən keçirmiş. Görür ki bir neçə adam topa sünbüllərin gövdəsindən tutub baş hissəsini ocaqda ütür və sonra da yeyirlər. Bu mənzərəni seyr edən Sarı Aşıq belə bir bayatı deyir:

*Aşıq aşı bişirər,*
*Bilməz naşı bişirər.*
*Aşıq bir hikmət görüb*
*Ayaq başı bişirər.*

Sarı Aşıq aylı gecələrin birində yol gedirmiş. Su yığılmış çalalarda həşəratların boğulduğunu görüb deyir:

*Aşağıdan ay doğdu,*
*Cansız canlını boğdu.*

Səhəri günəşli gündə arıların beçə verdiyini görəndə axşamkı bayatını tamamlayır:

*Anası beşikdə ikən,*
*Qızı bir oğlan doğdu.*

Sarı Aşıq səfər zamanı bir atlıya rast gəlir. Atın üstündə xeylı gəbə və kilim varmış. Bunları görən aşıq bir bayatı çağırır:

*Mən Aşığam, bir ata,*
*Bir oğuldu, bir ata.*
*Qırx dəvə, səksən qatır*
*Yüklənibdir bir ata.*

Atlı təəccüblənir ki, bu boyda yükü at götürə bilərmi. Aşıq isə işarə ilə atın üstündəkilərini göstərir. Atlı səhvini anlayır və aşığa sağ ol deyir.

Sarı Aşıq yenə səfərdəymiş. Həkəri çayının sahillərində bir gəlinin saxsı səhənglə su aparmaq üçün gəldiyini görür. Gəlin səhəngi suya salanda o çayın içindəki daşa dəyərək sınır. O səhəngin sındığını görüb çox peşman olur. Bu mənzərəni görən Sarı Aşıq ona mis səhəng almağı məsləhət verir:

*Mən Aşığam, yerim sal,*
*Kürdü üstə yerim sal.*
*Sağ saldın, sayrı çıxdı,*
*Aşıq deyir yeri mis al.*

Səfərlərindən birində Sarı Aşıq çay kənarından keçərkən uşaq çığırtısı eşidir. Ora yaxınlaşanda görür ki, bir neçə uşaq gicitkənlərin arasına düşüb. Gicitkən onları daladığından uşaqlar qışqırırlar. Aşıq onları azad edərək belə bir bayatı söyləyir:

*Mən Aşığam, nədəndi,*
*Nə sünbüldü, nə dəndi.*
*Ağzı yox adam tutar,*
*Tapın görüm nədəndi?*

Sarı Aşıq səfərə çıxarkən bir evdə qonaq olur. Səhər tezdən evin xanımı inəkləri sağıb südünü ocağın üstündə qazanda bişirirmiş. İstidən südün üzü qaymaqlanırmış. Bu mənzərəni seyr edən Sarı Aşıq belə bir bayatı-bağlama deyir:

*Mən Aşığam, buz bağlar,*
*Əyri bağlar, düz bağlar.*
*Aşıq bir hikmət görüb,*
*Od içində buz bağlar.*

Yenə Sarı Aşıq bir dostugildə qonaq olur. Dostu ilə deyişmə zarafatları varmış. Həmişə bir-birini çətinə salan bağlamalar işlədirmişlər. Yenə belə olur. Sarı Aşıq dostuna deyir:

*Mən Aşıq, qan ayağı,*
*Qan əli, qan ayağı.*
*Aşıq bir şey görübdü:*
*Üç başı, on ayağı.*

Dostu buna inanmır, "belə şey olmaz", – deyir. Xeyli mübahisələrdən sonra Sarı Aşıq dostunu həyətə gətirir. Ona inək sağan qadını göstərib deyir:

– Qadın, inək və buzovun başlarını və ayaqlarını say! Dostu gülərək yenə uduzduğunu etiraf edir.

Sarı Aşıq yenə səfərdəymiş. Bir meşədən keçəndə xeyli adamın yığıldığını görür. Yaxınlaşıb diqqət edir. Adamlar nəyisə soyub, sonra dəmir şişlərə taxaraq ocaqda bişirib yeyirlər. Bunun səbəbini soruşanda onlar deyirlər ki, kirpini ovlayıb ətini bişirib xəstə insana verirlər, o tezliklə sağalır. Bu mənzərəni seyr edən Sarı Aşıq belə bir bayatı-bağlama söyləyir:

*Mən Aşıq, oxun atdı,*
*Ətin dərmana qatdı.*
*Aşıq bir yemiş yedi*
*Saplağı dəmir qatdı.*

Belə rəvayət edirlər ki, Sarı Aşıq vətən torpaqlarını gəzməyə çıxıbmış. Bir kənddən keçəndə orada matəm olduğunu, insanların ağladığını görür. O da bu insanların dərdinə şərik çıxır. Sonra yoluna davam edərək başqa bir kənddə toy şənliyinin olduğunu, insanların sevinib oynadığını müşahidə edir. Bu hadisələrdən təsirlənib belə bir bayatı söyləyir:

*Mən Aşıq, Keçibelə,*
*Kəmərin keçi belə.*
*Gah ağla, gah gül, Aşıq -*
*Gününü keçi belə.*

Sarı Aşığın yolu abad bir kənddən keçirmiş. Orada yaraşıqlı evlərin pərdələrlə örtülməsi onun diqqətini cəlb edir. Yoluna davam edərək kəndin dəyirmanına baş çəkir. Burada hündürdən tökülən suyun dəyirmanın nəhəng

pərini necə hərəkətə gətirdiyini və bunun nəticəsində buğdanın üyüdüldüyünü müşahidə edir. Elə buradaca belə bir bayatı deyir:

*Mən Aşıq, pərdəlidi,*
*Evləri pərdəlidi.*
*Nov dərin, su sərindi,*
*Görən deyir pər dəlidi.*

...Sarı Aşıq səfərlərindən birində görür ki, bir qadın Həkəri çayının qırağında paltar yuyur. Birdən qadın çayda balıq görür. Daşla vurub balığı öldürür. Sonra onu təmizləyib evə aparır, bişirərək ailəsi ilə yeyir. O dövrdə qadınların heyvan kəsmələri haram sayılırdı. Amma balığı yemək olardı. Bu hadisələri izləyən Sarı Aşıq belə bir bayatı söyləyir:

*Atdım-tutdum, daş deyil,*
*Qanadlıdı, quş deyil.*
*Onu vuran ər deyil,*
*Yeyilsə də, ar deyil.*

Sarı Aşıq məşhur bir bayatısında söyləmişdi:

*Mən Aşıq, Güləbirdə,*
*Şeh düşüb gülə bir də.*
*Bir quş olub uçaydım,*
*Qonaydım Güləbirdə.*

Göründüyü kimi Sarı Aşığın da ruhu narahatdır. O da böyük Güləbird elinin doğma yurd yerlərinə, əzəli məskənlərinə qayıdacağı günü gözləyir. Onda da xalq birinci olaraq Sarı Aşığın və Yaxşının ziyarətinə gedəcək, arzuları çin olduğu üçün onlara dualar edəcəklər, narahat ruhları nigarançılıqdan qurtaracaqlar. O gün uzaqda deyil...



**Yaqub ABBASOV,**
***Rizvan Hümbətov adına Güləbird kənd tam orta məktəbinin riyaziyyat müəllimi, Azərbaycan Jurnalistlər Birliyinin üzvü***

**POEZİYA**



**Saqif ZEYNAL**

İsayev Saqif Zeynal oğlu Laçın rayonunun Qarakeçdi kəndində anadan olub. Riyaziyyat-informatika müəllimi işləyir.

### NƏNƏMİN BAYRAĞI

Nənəm bizə corab toxumaq üçün
Boyadığı rəngli iplərdən
Bir bayraq toxumuşdu o payız...

Bəxtimizin doğmayan ulduzunu,
Yarım doğan ayını da toxumuşdu
bayrağa...

O ili burnu deşik,
Dabanı cırıq,
Taykeş,
Adamı isitməyən yardım
corablarıyla
Başa vurmuşduq...

Ayaqlarımın yaddaşına
hopmuşdu,
O ilin amansız soyuqları.
Ona görə də hər payız gələndə
Üşüyür ayaqlarım...

Çarəsizliyimizin susdurulmuş
bayrağını
Arıqlıqdan qabırğaları sayılan
Daxalımızın ən hündür yerinə
sancmışdım!
Fikir vermişdim –
Nənəm bayatı hönkürə-hönkürə
Ac qalan azadlığımıza
ağlayanda
Əllərinin titrəməsini də toxuduğu
bayraq –
Burnunu külək əsən tərəfə
uzadıb
Havanı qoxlayırdı...

### O TAYDAN DA QƏRİB QIZ

Burda uzaqlar yaşayır,
Adamları qərib-qərib.
Əllərimi çiçək kimi
Əllərindən dərib, dərib...
Çıxıb getdi külələri,
Hər yan sərhəd dirəkləri...
O taydan da qərib bir qız
Nəmli-nəmli baxışını,
Məftillərə sərib, sərib...

Bu ömür bir qəfil qəza,
Nələr gəldi başımıza.
Bir də çıxmaz qarşımıza,
Tanrımız da çıxıb getdi
Yollarını yığıb, yığıb...

**OVQAT**

## VƏTƏNDƏ GÜMANSIZ VƏTƏN

Vətən! Sadə bir söz, dildə deyilməsi asan olan, ancaq ürəkdə daşınması çox çətin bir ifadədir.

Bu ad nə qədər sadə və deyilişi asan olsa da, məsuliyyətini qorumaq, yaşatmaq bir o qədər çətindir.

Vətən dedikdə ilk öncə üzərində yaşadığın torpaq, içdiyin su, nəfəs aldığın hava yada düşür. Bəs Vətən haradan başlanır? Vətən onun sərhədlərindən – səndən, məndən, ondan başlanır.

Bir zaman gəlir ki, insan vətənsiz yaşaya bilmir, özünü doğma yurdsuz, elsiz təsəvvür edə bilmir. Vətənsiz insan susuz ağac kimidir. Nə qədər sağlam olsa da, əvvəl-axır quruyub məhv olacaqdır. İnsan ömrünü zəngin, həyatını mənalı edən doğma vətəninə, elinə xidmətdir.

Doğma vətənim Azərbaycan müxtəlif xalqları, dinləri fərq qoymadan öz qoynunda bəsləyən yeganə anadır. İnsan dünyaya göz açanda ilk anasını görürsə, vətən torpağında da ilk addımlarını atır. O torpağın verdiyi nemətlər sayəsində böyüyür, ucalır, “ana” kəlməsini deyir. Vətən dedikdə ilk olaraq yada düşən onun sərhədləridir. Yəni ki, Azərbaycan torpağına səpələnmiş hər kəs vətəninin sərhədini qoruyan bir əsgərdir.

Tarixən sərhədimizin müqəddəsliyi xalqın qeyrəti ilə bir tutulmuşdur. Babalarımız Vətənin sərhədlərini göz bəbəyi kimi qoruyub gələcək nəsillərə əmanət buraxıblar. Nə qədər mənfur, yadelli hücumlar olubsa, canları, qanları bahasına bir qarış torpaq belə düşmənə verməyiblər.

Vaxtilə Azərbaycan böyük bir əraziyə malik nəhəng imperiya olmuşdur. Səfəvilər dövləti Dəmirqapı Dərbənddən İran körfəzinə qədər böyük bir ərazini əhatə edirdi. Bu dövlət bizə Şah İsmayıl yadigarı idi. Lakin...

*Qoruya bilmədik, bimədik səni,*
*Qoruya bilmədik, anamız vətən.*
*Torpağına sahib oldu “dığalar”,*
*Pay götürdü səndən hər yoldan ötən.*

Əsrlər boyu respublikamızın ərazisi hərbi yürüşlərə və qəsblərə məruz qalmışdır. Bir zaman xanlıqlara parçalanan, öz daxilində başlanan qardaş sa-

vaşının sonu böyük Azərbaycanı 1813-cü il oktaybr ayının 12-də Gülüstan sülh müqaviləsi ilə iki yerə böldü.

Deyirlər, yıxılana balta çalmazlar. Lakin 1828-ci ildə bağlanan Türkmənçay müqaviləsi Vətənimizə baltanı kökündən vurdu. 280 min $km^2$ sahəyə malik olan Cənubi Azərbaycan torpaqları İrana, 214 min $km^2$ sahəyə malik olan Şimali Azərbaycan torpaqları Rusiyaya verildi. Əti dırnaqdan ayıran kimi, Vətənimizin şimalını cənubundan ayırdılar. Rusiyanın işğalçı siyasəti nəticəsində dədə-baba torpağımız Dərbənd də Dağıstan Vilayətinin tərkibinə qatıldı. Elə bu vaxtlardan etibarən etnik dayaq yaratmaq məqsədi ilə ermənilərin torpaqlarımıza kütləvi şəkildə köçürülməsi başladı. Bu siyasətin nəticəsi İrəvan xanlığının başında çatladı. Əzəli Azərbaycan torpağı olan, adına şeirlər, dastanlar, mahnılar qoşulan İrəvan torpağı da soyu, kökü bilinməyən ermənilərə verildi.

Qərbi Azərbaycana, Dədə Ələsgər yurdu olan Göyçə mahalına sahib olan mənfur soysuz ermənilər daha sonra bizimlə Qarabağ savaşına başladılar:

*Elə bil çovğunam, elə bil qışam,*
*Vətəndə vətənsiz qərib bir quşam.*
*Dərdimi deməyə ünvan tapmıram,*
*Artıq yaşamağa güman tapmıram.*

Qarabağ... Azərbaycan kimi şah ölkənin tacı... Tacı isə başda gəzdirərlər. Çox-çox təəssüflər olsun ki, Azərbaycanımızın bu dilbər guşəsini qoruya bilmədik. 1988-1994-cü illər ərzində Qarabağı və onun ətrafında olan 7 rayonu itirdik. Odu-ocağı yağmalanmış, torpağı tapdalanmış, sərvəti talanmış bu elin həsrəti hamımızın qəlbini göynədir. Əzəmətli Dəlidağ, min illər boyu düşmənə təslim olmayan Şuşa qalası, qartallar məskəni Laçın, hər bir otu, suyu min bir dərdə dərman olan Kəlbəcər, Qubadlı, Cəbrayıl, Ağdam, Zəngilan və digər dilbər guşələrimiz bir göz qırpımında əlimizdən uçub getdi. Qan ağlayır Həkəri çayı. İsa bulağının həsrət çəkən gözləri kor olub artıq:

*Ocağım yanıbdır, qalıbdır külü,*
*Kül altda varmıdır közüm, bilmirəm.*
*Qabaq laçınlıydım, var idi yurdum,*
*İndi haralıyam, özüm bilmirəm.*

Hal-hazırda respublikamız quruda beş, dənizdə isə dörd ölkə ilə həmsərhəddir. İstər daxili asayişin qorunmasında, istər sərhədlərimizin mühafizə edilməsində cəsur, mərd Azərbaycan oğulları gecə-gündüz daima vətənin keşiyindədir. Azərbaycan torpağı bütün azərbaycanlıların ümumi evi, sərhədi isə onun qapısıdır. Bu qapı dost kimi gələnlərin üzünə açıq, düşmən kimi gələnlərin üzünə bağlıdır. Bu qapının keşiyində nəinki igid Azərbaycan əsgəri, bütün Azərbaycan xalqı dayanmalıdır.

Artıq dünya Azərbaycanı öz səsi, öz qüvvəsi olan dövlət kimi tanıyır və hörmət edir. 2016-cı il Aprel döyüşləri bir daha sübut etdi ki, vahid Azərbaycan ordusu istənilən an öz torpaqlarını geri qaytarmaq iqtidarındadır. Mən inanıram ki, vahid Azərbaycan hökumətinin yürütdüyü uğurlu daxili və xarici siyasət nəticəsində zaman-zaman itirilmiş bütün torpaqlar – Güneyli, Quzeyli Azərbaycan vahid mərkəzdə tezliklə birləşəcəkdir.



Düşmən bizim sərhədlərimizi parçalasa da, ürəyimizi, beynimizi, əyilməz ruhumuzu, xalqımızın şanlı keçmişini heç bir vəchlə bölə bilmədi. Nə qədər ki, el yolunda şam olub əriyən, yalnız özləri üçün deyil, Vətən üçün, millətimizin, xalqımızın xoşbəxt gələcəyi üçün yaşayan oğul və qızlarımız var, deməli, Azərbaycan da əbədi yaşayacaq və daima inkişaf edəcəkdir!

**Ruhulla ABUZƏROV**

**POEZİYA**

**Akif AZALP**



## MARAFONÇU

*Öz həyatı bahasına sülhün və qələbənin müjdəsini çatdıran ilk marafonçunun əzmini yad edərək...*

Ümidlər sırsıra bağlayır artıq,
Harda qaldın, gəl çıx, hey, marafonçu!
Haqqın səbri daşıb çağlayır artıq,
Gəl çıx, qanad açıb, ey milyonlarla
Nakam ürəklərin yalqız ovuncu!
Əminəm, Xeyirlə Şər arasında,
Görünməz yerlərdə, göylərdə gedən,
Son döyüşün sonun sezib əvvəldən,
Sən artıq müjdənlə çıxmısan yola!
Hara çatdığını biləydim bircə,
Görərdin, məlhəmə dönürəm necə!..
Bəlkə, yaralardan üzgün əsgərsən,
Gəlirsən Laçından, ya Əsgərandan?!
Bəlkə, Daşaltıda qeyb olan nərsən,
Dönürsən zindandan, ya asimandan?!
Hardan gəlirsən gəl, təki gəlib çıx,
Ey sülhün yolunda hey təngnəfəs!
Mən səni görürəm yer-göy qarışıq,
Mən səni görürəm, gözəgörünməz!..
İçdiyin andlara sadiq nər kimi,
Bilirəm, düz hara gələcəyini:
Orda səni gözlər Müqəddəs Məzar,
Orda səni gözlər Qutsal Xiyaban!
Özlər səni hər bir sülhə intizar,
Özlər səni hər bir Haqqa tapınan!
Qanad gər, çempion, köksündə yara,
Çıxmadan, neçə can gözləyir səni!
O taylı, bu taylı üzü dağlara,
Bütün Azərbaycan gözləyir səni!..

***2014***

## GƏLSƏN, ÖZÜN GƏLMƏ

Gəlsən, özün gəlmə!
Mənə yaddaşımın yadını gətir,
Bir də baxışımın odunu gətir,
Bir də dodağımın dadını gətir!

Gəlsən, yalqız gəlmə!
Mənə təkliyimin röyasın gətir,
Bir də o dənizin havasın gətir,
Heç olmasa, bir cüt dalğasın gətir!

Gəlsən, təkcə gəlmə!
Sənsiz illərimin qədrini gətir,
Bir də o baharın ətrini gətir,
Şeirimin bir yanar sətrini gətir!

Gəlsən, elə gəlmə!
Onlar da sənintək düşəndən uzaq,
Yovuşmaz oldular heç kimə heç vaxt,
Gəlsələr, səninlə gələrlər ancaq!

Gəlsən, özün gəlmə!..

***1979***

**MÜSAHİBƏ**



***"HƏKİMLİK, YAXŞILIQ YAŞASA QOŞA, SƏNİ DƏ SEVDİRƏR, QALDIRAR BAŞA"***

***Hörmətli oxucular, jurnalın çapında fasilə yaranması səbəbindən diqqətinizə çatdıra bilmədiyimiz təxminən 1 il əvvəlki müsahibəni gec də olsa sizə təqdim edirik. Əvvəlcə həmsöhbətimiz Həsənov Əhmədəli (Əhməd) Abduləli oğlunun bioqrafiyasını öz dilindən eşidək:***

*– 1948-ci ildə Laçın rayonunun Ağbulaq kəndində anadan olmuşam. İbtidai sinfi öz kəndimdə oxumuşam. Kim qışda arana köçüb gedirdisə, onun evini qışda məktəb edirdilər. 2 müəllimimiz vardı: Bəbir müəllim və Camal müəllim. I-III siniflər və II-IV siniflər paralel idi. Radio yox, işıq yox, çıraq işığında oxuyurduq, amma yaxşı çalışırdıq. IV sinfi qurtarandan sonra Leninkənddə (indiki Qarakeçdi) VII sinfi bitirdım.*

*Kəndimizdə orta məktəb yox idi. Minkənd kəndində isə orta məktəb vardı. Bizim vaxtımızda 11 illik idi. XI sinfi də burada başa vurdum. 1966-cı ildə indiki Azərbaycan Tibb Universitetinin müalicə-profilaktika fakültəsinə qəbul oldum. 1973-cü ildə ali tibb məktəbini müvəffəqiyyətlə qurtardım. İlk interna bizim vaxtımızda başladı. Məni Cavadzadənin kafedrasına göndərdilər. 1 il urologiya ixtisası üzrə interna keçdim. O kişi də, Allah rəhmət eləsin, çox tələbkar, bilikli adam idi.*

*1974-cü il avqustun 1-dən taleyimi Sumqayıt şəhərinə bağladım. Deməli, mən bura gələndə 2 uroloq var idi: İbadov, bir də erməni Xaçiyev. Mən, demək olar ki, hazırlıqlı gəlmişdim. Düzü, ona qədər urologiya heç inkişaf da etməmişdi. 1975-ci ildən 1 №-li Sumqayıt Şəhər Xəstəxanasının urologiya şöbəsinin müdiriyəm. Sumqayıt camaatına xidmət etmişəm. Hətta rəhmətlik Cavadzadə uroloji xəstəliklə bağlı Sumqayıtdan onun yanına gedənlərə "Bura nəyə gəlmisiz? Əhməd Sumqayıtdadır də" – deyərdi. Çalışıb uroloji xidməti yüksəltdik. Bildilər ki, Sumqayıtda uroloq da var. Elə o vaxtdan bu vaxta qədər xalqımıza tibbi xidmət göstəririk. Bir neçə dəfə attesstasiyadan keçmişəm, ali dərəcəli uroloqam. Sözün düzü, elmin dalınca düşmədim. Müxtəlif ölkələrdə qurultaylarda olmuşam. Ümumiyyətlə, urologiya sahəsində ən son yenilikləri öyrənməyə və tətbiq eləməyə çalışmışıq.*

***– Doktor, o vaxtlar indiki kimi repititor yanına getmək yox, xüsusi hazırlıq kursları yox. Tibb Universitetinə qəbul zamanı "konkurs"dan keçməyin də öz çətinlikləri. Belə bir şəraitdə ucqar dağ kəndindən gələn abituriyentin respublikanın ən reytinqli ali məktəbinə qəbul olması asan idimi?***

*– Təbii ki, asan deyildi. Amma buna təəccüblənmək də doğru olmazdı. Minkənd kəndindən çox savadlı adamlar çıxıb. Orada müəllimlər can yandırır, şagirdləri yaxşı hazırlayırdılar. Əlavə hazırlıq yox idi. Minkəndin özündən nə qədər həkimlər, başqa sahələr üzrə tanınmış alimlər olub. Amma öz kəndimizdə 1-ci həkim mənəm. İndi 5-6 nəfər var. Deyim ki, müəllimdən çox şey asılıdır. Müəllimi həmişə ali bir insan, müqəddəs hesab eləmişik. Müəllim bizim üçün ideal idi. Dərsə getməyəndə axşam müəllim evə gəlir, harada olmağımızla maraqlanır,valideynlərimizdən dərsə gəlməməyimizin səbəbini öyrənirdilər. Bizi daha yaxşı oxumağa həvəsləndirirdilər. Bunların da nəticəsi olaraq elm, savad qazanırdıq. Biliyə zaval yoxdur. Kim deyirsə ki, bilirdim, ay qiymətimi elə kəsdilər, belə kəsdilər, boş söhbətdir. Kim bilirsə keçir.*

***– Universitet illərini necə xatırlayırsız? Yadınızda daha çox kimlər və necə qalıb?***

*– Yadımda daha çox qalan anatomiya kafedrasının müdiri, professor Kamil Balakişiyevdir. Çox təmənnasız bir adam idi. Tramvayda gedəndə biletini başının üstündə tuturdu ki, hamı görsün, tələbələr ona bilet almasınlar. Kafedrada gözəl bir anatomiya muzeyi yaratmışdı. Dünyada anatomiyaya aid elə bir preparat yox idi ki, həmin muzeydə olmasın. Çox ideal bir adam idi. Uşaqlar çalışırdılar ki, o kişiyə imtahan versinlər. Çünki bir sualın cavabını bilməsəydin, amma "professor, oxumuşam, yadımdan çıxıb" – desəydin, o sualı təzədən sənə başa salar, heç olmasa bir "3" yazardı. "Oxumamışam" – deyən tələbəni isə bağışlamazdı.*

*Bir də Adil müəllim vardı. Rəhmətlik çox yaxşı adam idi. Həkimlik fəlsəfəsindən yazmışdı. Dərsdə mühazirə oxumaqla kifayətlənməz, həyatdan da danışardı. Yaxşı insan, yaxşı həkim olmaq üçün bizə tövsiyələrini verərdi. O qədər alicənab bir adam idi ki, hamı onu çox istəyirdi. İndi də yadımızdan çıxmır elələri. Tələbədən nəsə uman müəllimlər də vardı. Amma əksəriyyəti yaxşı müəllimlər idi. Pis müəllimlər də yavaş-yavaş sıradan çıxırlar.*

***– 1966-cı ildən çıxdığınız kəndlə, kənd camaatı ilə necə əlaqə saxlayırdınız?***

*– Hər il yayda kəndə gedirdim. Mən kəndə çox bağlı adamam. Yaşlı insanlarla görüşürdüm. Evimiz heç vaxt qonaqsız olmurdu. Kəndə gedəndə mənim şərəfimə xüsusi qonaqlıq verilərdi. Qohumlar, dostlar yeyib-içib gedirdilər. Boş vaxtlarımda yoldaşlarla Ağdərə çayının qırağına gedirdim. O qədər mənzərəlidir ki... Bir tərəfdən dağlardır, bir tərəfdən qayalar. Gur çaydır, axıb gedir, yuxarıda da qartallar adamın başının üstündə qıy vururlar. O mənzərədən, sakitçilikdən həzz alırdıq. Saatlarla orada otururduq. Sonra dostlar gəlirdi, torla balıq tuturduq. Özü də bizdə farel balıq idi, başqa balıq olmurdu.*

*Bir dəfə Hacıxanlı çayında (Şəlvə çayının Hacıxanlı kəndindən keçən hissəsi) torla balıq tutub gəldim sizin kəndə – İmanlara, rəhmətlik Zərifə xalamgilə. Bizim camaat çox qonaqpərvərdi. Laçın camaatı kimi qonaqpərvər camaat mən heçarda (heç bir yerdə) görməmişəm. Kəndə getdiyim günlərdə boş vaxtım olmurdu. Gəlirdilər, görüşürdülər, qonaq çağırırdılar. Getməyəndə də inciyirdilər. Unudulmaz günlər idi. Şəhərə qayıdanda da rəhmətlik nənəm aş bişirirdi. Adını da qoyurdu "ayrılıq aşı". Gözümüzdən yaş gələ-gələ yeyirdik. Adam kənddən ayrılmaq istəmirdi. Təəssüflər olsun ki, o kəndə gedə bilmirik, təkcə xatirələr qalıb.*

*– **Uşaqlıq dostlarınla əlaqələriniz qalırmı?***

*– Görüşürəm həmişə. Uşaqlıq dostu heç vaxt unudulmur. Bu dostluğun əvəzi yoxdur. Uşaqlıq illərində Cəfərqulu adlı dostum vardı, qaçqınlıqda itkin düşdü. Nadir vardı, uzun illər şofer işlədi. Mən birinci dəfə maşın sürməyi onun "QAZ-51"-ində öyrəndim. O da, uşaqlıq dostum Şükür də rəhmətə gedib. Bir sözlə, tay-tuşlarımın çoxu qalmayıb.*

***– Laçınlılar qaçqınlıqdan əvvəl də, sonra da sizin yanınıza çox gəlirdilər. Bir həkim kimi camaatımızın sağlamlıq durumunu necə qiymətləndirirsiniz?***

*– Qaçqınlıq çox ağır bir dərddi. Son vaxtlar, demək olar ki, hər gecə o yerləri yuxuda görürəm. Bizim camaat də elə bilir ki, Əhməd həkimdən yaxşı həkim yoxdu. Ağcabədidən, Bərdədən, Yevlaxdan tutmuş hər yerə səpələniblər. İmkanımız daxilində kömək eləyirik. Sağlamlıqlarının keşiyində dururuq. Kövrəlirik, söhbətləşirik. Axırda da deyirik ki, dövlətimizin hərbi gücü artır, möhkəmlənir. Cənab Prezidentimizin köməyi ilə dədə-baba yurdlarımıza qayıdacağıq.*

*Bizim kənd Ağbulaqdı. Kəndin yuxarı tərəfindən bulaq çıxırdı. Çıxan kimi də çay əmələ gətirirdi. Bu bulağın suyu aşağıda 5-6 dəyirman işlədirdi. Respublikanın hər yerini gəzmişəm, o cür gur suyu olan bulağa rast gəlməmişəm. Qonaqlar da gələndə deyirdim gəlin mərc gələk, görüm kim barmağını 1 dəqiqə o bulaqda saxlaya bilər. Suyu buz kimi idi. Hər kəs o bulaqdan qapısına su çəkmişdi. Müasir evlər tikilmişdi, hamının vəziyyəti yaxşılaşmışdı, kasıb adam qalmamışdı. Bizim camaat qeyrətli camaatdı, zəhmətkeşdi. İndi də Ağcabədidə inşa edilmiş Taxtakörpü qəsəbəsində qalırlar. Yayda gedirlər Daşkəsənə. Çətin şəraitdə, alaçıqda yaşayırlar, mal-heyvan saxlayırlar. Yayda Daşkəsənə – camaatımızın yanına gedirəm. Alaçıqda 10 gün qalmaqla bir balaca təskinlik tapıram. Kəndimizin iyini buradakı camaatımızdan alıram. Başqa heç yana, sanatoriyaya, kurorta getmirəm.*

***– Alaçıqda olan vaxtı da sizə həkim kimi müraciət edənlər olurmu?***

*– Əlbəttə, müraciət edənlər olur. Mən də müalicə yazıram, məsləhətlərimi verirəm. Bircə əməliyyat edə bilmirəm, çünki əməliyyat üçün şərait yoxdur. Daşkəsənə qardaşım Vaqiflə gedirik. Bunun da məclisdə yaxşı deyib-gülməyi, "onektod" söyləməyi var. Həm də kənd icra nümayəndəsidir. Özümlə aparıram ki, camaatın şikayətlərini də eşitsin.*

***– Bir uroloq kimi müşahidələrinizi də bizimlə bölüşərdiniz. Son vaxtlar uroloji xəstəliklər artıbmı, azalıbmı?***

*– Son vaxtlar böyrək daşları çoxalıb. Ola bilər ki, əvvəllər də çox olub, amma ultrasəs, kompüter tomoqrafiya, maqnit rezonans müayinələri indiki səviyyədə olmadığına görə vaxtında aşkarlanmayıb. Böyrəkdə və bədənin digər üzvlərində isə şiş xəstəlikləri doğrudan da artıb. Bəlkə də havayla, süni qidalarla əlaqədardır. Hərə bir fərziyə deyir. Ürək, şəkər xəstəlikləri də çoxalıb. Həkimin vəzifəsi odur ki, xalqına xidmət eləsin, insanların sağlamlığını qorusun.*

*Həkimlik praktikasında nə qədər adamlar sağaltsan da, sağalda bilmədiyin xəstələr da olur. Tək məndə yox, bütün həkimlərdə belədir. Müalicə etdiyim xəstənin ölümünü həmişə çox pis qəbul edirəm. O qədər ağır qəbul edirəm ki, heç vaxt yadımdan çıxmır. Yaranan bir gün gedir, bu, təbiətin qanunudur. Bir var əlacı olan, bir də var əlacı olmayan xəstəlik. Hərdən belə hallarla qarşılaşanda deyirəm ki, mən niyə həkim oldum. Həkimin ən sevincli anı odur ki, xəstə gəlib deyir ki, sağ ol, sağalmışam, evə gedirəm. Dünyada bizim üçün bundan böyük xoşbəxtlik yoxdur. Çoxu məktub yazır, zəng edir. Bəziləri minnətdarlığını şeirlə bildirir. Hərdən məndən şeir yazıb-*

*yazmamağımı soruşurlar. Deyirəm vallah elə şeir yazanlar olub ki, mən şeir yazsam, onlarla müqayisədə çox gülməli çıxar. Həmişə Səməd Vurğunu misal gətirirəm. Hansısa bir işlə o işi bacaran məşğul olmalıdır. Dad yarımçıq əlindən. Həkimlik də belədir.*

***– Gənc həkimlərlə münasibətiniz, onlara inamınız necədir?***

*– Həmişə çalışmışam ki, gəncləri irəli çəkəm. İndiyədək 15 nəfər uroloq yetişdirmişəm. Həkimlikdə bilikdən də çox təcrübə vacibdir. Bəziləri çalışıb onu qazanır. Amma bəziləri institutu qurtaran kimi deyir ki, mən həkiməm. Zaman keçdikcə yavaş-yavaş nəzəri biliklərini tətbiq etməyə başlayır və anlayır ki, hələ heç nə bilmir. Təcrübəsi olmayan adam institutu əla qiymətlərlə qurtarsa da, haradasa 1-2 il kursda olsa da, hələ kamil həkim deyil. Bir dəfə müəllim xəstəni tələbənin yanına gətirir ki, diaqnoz qoysun. Tələbə əlini xəstənin qarnına qoyan kimi deyir ki, apendisitdir. Sonra xəstəni akademik müayinə edir. Qarnına baxır, siptomlarını yoxlayır, xəstəni bir saat sorğu-suala tutur. Axırda o da deyir ki, apendisitdir. Tələbə bildirir ki, bunu mən də demişdim də. Müəllim üsə diaqnozun qoyuluşunda tələsməməyi məsləhət görür, çünki başqa xəstəliyin də ola biləcəyini söyləyir. Həkimlikdə səhv eləmək ağır məsələdir. Gərək səhv eləməyəsən. İndiki bəzi gənc həkimlər təəssüf ki, tələsirlər. Hətta bilmədiklərini də bildiklərini deyirlər. Təki xəstələri olsun. Bu isə düzgün deyil. Bacardığın işdən yapışmalısan, bacarmadığını əvvəlcə etiraf etməlisən, sonra öyrənməlisən.*

*Bu yaxınlarda nəvəmin qolu sınmışdı. Apardım bir professorun yanına. Özümü təqdim elədim. O özü bu sahəni yaxşı bilirdi. Amma professor məni 3-cü mərtəbədə başqa bir həkimin yanına göndərdi. Halbuki o özü bilikli mütəxəssis idi, uğurlu əməliyyatlar edirdi.*

*Həmin həkimin yanına getdim və əməliyyat da müvəffəqiyyətlə keçdi. Mənim özüm də xəstəni müayinə edəndə diaqnozu dəqiqləşdirirəm. Görsəm ki, müalicə edə biləcəyim xəstədir, götürürəm, əgər bacarmıramsa yönəldirəm başqa yerə.*

***– Bir az da xəstə-həkim münasibətlərindən danışaq...***

*– Mənə hərdən zəng edirlər ki, bu xəstəyə yaxşı bax. Mən ona zəng edirəm ki, qardaş, həkimlə xəstədən bir-birinə yaxın heç kim yoxdur. Sən əgər həkimsənsə, bu da xəstədir. Xəstə inciyər də, küsər də, narazı da qalar, kövrək də olar, ancaq sən bütün hallarda ona qayğı ilə yanaşmalısan. Həkimlə söhbət zamanı hansısa xəstə bir balaca ümidlənmirsə, deməli, o, yaxşı həkim deyil. Xəstə olub ki, mənimlə dalaşıb da, ağır söz də deyib. Qətiyyən*

*reaksiya verməmişəm. Öz işimi görmüşəm, sonra gəlib ki, həkim, bağışla. Sən həkimliklə məşğul olursansa, hər şeyə dözməlisən. Rəhmətlik Emin Əfəndiyev – o vaxtı kafedra müdiri idi – bizə ilk mühazirəsində demişdi:* ***"Həkimlik, yaxşılıq yaşasa qoşa, Səni də sevdirər, qaldırar başa"****.*

*Həkim olmaq azdı, yaxşı insan olmaq lazımdır. Yaxşı insan deyilsənsə, yaxşı həkim ola bilmərsən. 20 il əvvəl müalicə etdiyim insanlar var ki, indi də zəng edirlər, həkimlərini unutmurlar. Bizim xalq çox qədirbilən xalqdır.*

***– Uzun illər göstərdiyiniz xidmətin müqabilində insanların sevgisini qazanmaq, dövlət tərəfindən mükafatlandırmaq necə hissdir? Əməkdar həkim fəxri adına layiq görüləndə hansı hisslər keçirdiniz?***

*– Çox yaxşı hissdir, sevindiricidir. Allah-taala Prezidentimizin canını sağ eləsin. Mənim əməyimə, o cümlədən bütün səhiyyə işçilərinə verilən ən yüksək qiymətdir. Mən böyük qürur hissi keçirirəm ki, ömrümün bu yaşında mənə bu ad verildi. Ən böyük sevincimizi Prezidentimizin ətrafında birləşib torpaqlarımızı azad etmək arzumuz reallaşanda yaşayacağıq inşallah. İndi hamımız işğal günlərindən danışanda ağır hisslər keçiririk.*

***– Laçınlılar qaçqınlıqdan əvvəlki illərlə müqayisədə indi daha çox xəstələnirlər sanki...***

*– Xəstəlikləri əmələ gətirən ilk səbəb sinir sistemidir, fikirdir, qaçqınlıq dərdidir. Əvvəllər Laçında xəstələr az olurdu. Xəstəliyin çoxu fikirdən əmələ gəlir. Laçınlı xəstələr yanıma gələndə özümü bir anlıq kənddə hiss edirəm. Qucaqlaşırıq, dərdləşirik, sevinc-kədər qarışıq incə hisslər keçiririk. Ağbulaqdan gələn adam olanda elə bilirəm Ağbulaqdayam. O qədər təsir eləyir ki... Doğma yurd həsrətini sözlə ifadə etmək mümkün deyil.*

***– Övladlarınızdan yolunuzu davam etdirən varmı?***

*– Həkimlik həm çox şərəfli, həm də çətin və əzablı bir sənətdir. Xəstə yaxşı olanda sevincinin həddi-hüdudu olmur. Ayrı cür olanda çox ağır hisslər keçirirsən. Bəlkə də ona görə mən uşaqları həvəsləndirmədim bu sahəyə. Özüm çox çətin günlər keçirmişəm. Ağır xəstələr olanda günlərlə xəstəxanada qalmışam. Oğlumun biri hərbi sahədə xidmət göstərir, biri isə Sumqayıt Şəhər İcra Hakimiyyətində işləyir. Qızım bank sahəsində çalışır. Nəvələrim var. Hamı kimi mən də nəvələrlə uşaqlaşıram. Rəhmətlik atam zəhmli adam olub. Onun bir dəfə də bizi qucağna almağı yadıma düşmür. Nəvələr olanda boynuna alırdı. "Dövlətdə dəvə, övladda nəvə" deyimi elə-belə yaranmayıb.*

*Minkənddə bizim bir qohum vardı – Yelmar kişi. Yoldaşına Saçlı bibi deyirdilər. Çox nazlı bir qadın idi. Oğlu Müzəffər, gəlini Məxluqə ilə qalırdılar. Onların Saçlı bibinin yanında ixtiyarları yox idi ki, uşaqlara bir kəlmə söz desinlər. Bunların Süsən adlı ağlağan bir qızı vardı. Yaxşı xatirimdədir, bir qış günü idi. Biz də onlara qonaq getmişdik. Peçin qırağında oturmuşduq. Saçlı bibinin yanında oturan Süsən başladı mızıldamağa, düz bir saat kirimədi. Atayla ana da Saçlı bibinin yanında dinə bilmirdilər. Birdən Saçlı bibinin də səbri tükəndi. Süsənin üzünə bir şapalaq vurdu: "Kopaqqızı bəsdi də, sən nə qədər ağlayassan?". Müzəffər qayıtdı ki, "əlinə qurban olum, bunu bayaqdan elə də". Bu misalı ona görə çəkdim ki, gənc nəslə örnək olsun. O dövrdə böyüklərin yanında uşağın üstünə qışqırmaq da ədəbsizlik sayılırdı.*

***– Bizlərdə dədə-baba dostluğu da həmişə müqəddəs olub. İndi o dostluğu qoruyub saxlaya bilirikmi?***

*– Atam ailənin kiçik oğlu olub, özü də yetim böyüyüb. Anası Abtabın himayəsində tərbiyə alıb. Biz ona "ay nənə" deyirdik. Atam həddi-buluğa çatandan sonra, baxmayaraq ki, kasıbçılıqıydı, kəndə qonaq gələn hər kəsi evə gətirirdi. Ağbulağa gələnlərin elə biri yox idi ki, bizdə çörək kəsməsin. Atam boya-başa çatdı, kolxoz sədri, 20-25 il kənd sovet sədri işlədi, həddindən artıq dostları oldu. O dostların hamısını atam çörəklə qazanmışdı. Bizim evdə çörək kəsən adamlarla əlaqələri üzmürdü. Şəlvə zonasına ən əziz dostu Qovuşuqdan İsgəndər dayı idi. Atam yaxşı at minən idi, İsgəndər kişinin də yaxşı atları olurdu. Biri-birinə at bağışlayırdılar. Yalan olmasın, maşının 60-ıyla yorğa yeriyən atlar. Həmin atları 40 gün içəridə bağlayıb arpa verirdilər. İçəridən çıxardandan sonra o atları minmək hər oğulun işi deyildi.*

*İmanlarda rəhmətlik Alı dayı, Qaraca dayı, Daşlıda Xasay kişi atamın yaxın dostları idi. Atam həmişə onlara, onlar da bizə gəlib-gedirdilər. Minkəndin bazarına yol bizim kənddən keçirdi. Bazara gələnlər Abduləli kişinin evində çörək kəsməmiş getməzdilər.*

*Gedib-gəlməyəndə yolu kol-kos, şax-şəvəl basır. O vaxtın dostları təmənnasız dostlar idi. Bir də dostda nöqsan axtarsan, dostluq edə bilmərsən. Dost dostun nöqsanını üzünə deməlidir, bağışlamalıdır.*

*İmişli rayonundan bir kirvəmiz var idi. Məşədi İbrahim. Bizim dağlara gəlirdilər. 70 ildən sonra da bu kirvəlik, bu dostluq davam edir. Dostluq doğrudan da çox gözəl nemətdir.*

***– Siz Laçında doğulsanız da, həyatınızı Sumqayıtsız təsəvvür etmək mümkün deyil. Bu barədə nə deyərdiniz?***

*– Sumqayıtın səhiyyə sistemində elə bir həkim, tibb işçisi olmaz ki, mənim onunla münasibətim yaxşı olmasın. Sumqayıt camaatı da məni yaxşı tanıyır. Deyim ki, sumqayıtlılar əməksevər, çətinliyə sinə gərən, hər cəhətdən çox yaxşı insanlardır. Demək olar ki, 1974-cü ildən buradayam. Bugünədək eyni müəssisədə, eyni şöbədə işləmişəm. Əmək kitabçamda 2 əmr var. Biri internaturadan çıxmağım, biri də bura həkim təyin olunmağım barədə əmrdir. Sumqayıt camaatını çox sevirəm. Onlar da mənə həmişə böyük hörmət və ehtiram göstərirlər. Gəncliyim burada keçib. Yaşlı çağlarım da burada keçir. Sumqayıt mənim üçün doğma şəhərdir. Son 1-2 ildə Sumqayıt sürətlə inkişaf edib. Heydər Əliyev Mərkəzi, giriş yolları möhtəşəmdir. Cənab Prezident özü dedi ki, dənizkənarı parkı bir ildə yaratmaq möcüzədir. Sağ olsun icra başçımız, yaxşı işləyir, bütövlükdə Sumqayıta, o cümlədən də səhiyyəyə doğma münasibət bəsləyir. Gəlir, baxır, iradlarını bildirir, tapşırıqlarını verir. Çox razıyıq. Sumqayıt bir ailə kimidir, hamı bir-birini tanıyır.*

***– Bəlkə gözlədiyiniz hansısa sualı sizə vermədim. Son olaraq o suala cavabınızı eşitmək istərdim.***

*– Siz əhatəli suallar verdiniz. Amma mənim ən böyük nisgilim yenə də Laçındır, itirilmiş torpaqlarımızdır. Ən böyük arzum budur ki, Allahın izni, xalqımızın birliyi, Prezidentimizin qətiyyəti və ordumuzun gücü ilə bu həsrətə son qoyulsun. Mərhum şairimiz Məzahirin bir şeiri yadıma düşür:*

*Qarşımda dayanıb göz dağı kimi,*
*O dağın o üzü bizim Vətəndi.*
*Çıxar dəsmalını bir ağız ağla,*
*Bu qəm göz yaşısız çətin ötəndi,*
*O dağın o üzü bizim Vətəndi.*

*Səs verməz səsinə, ha qışqır, çağır,*
*Nə qədər çətindir, nə qədər ağır.*
*Allah, qayalara yenə qar yağır,*
*Elə bil anamın saçında dəndi,*
*O dağın o üzü bizim Vətəndi.*

*Sizə də minnətdaram ki, vaxt ayırıb gəlmisiz. Bu, mənə həm də ona görə xoşdur ki, Laçında boya-başa çatan insanlarla həmsöhbətəm. İstəyirəm ki, arzularımız gerçəkləşsin, Laçına qayıdışımız tezləşsin.*

***Söhbətləşdi: Arif MƏMMƏDLİ***

**ESSE**

## ANAMIN QOLLARI
*(24 noyabr anam ölən gündü)*



Anam öləndə özümü toplayıb ağlaşmada bacılarıma dediyim ilk söz bu oldu – anamın qollarını ağlayın. Ağlım kəsəndən anamı qarğaşalı görmüşdüm. Yeddi uşağından biri şəlləyində, hər qolunda bir dolu su vedrəsi yoxuşla evə qalxardı. Axşam-səhər inəkləri sağardı, qapı-bacada qalan işləri yerbəyer edəndən sonra ağır süd maşınını evin ortasına qoyub ilınmış südü çəkərdi. Mən yekəlib süd maşınının dəstəyini bılalıyanda (hərləyəndə) bunun nə qədər ağır iş olduğunu öz qollarımda hiss etmişəm. İlahi, anamın qolları nələr eləməzdi – bostan belləyərdi, qurumuş otu çevirərdi, xotman qoyardı, bağda yerə tökülən tutu dənləyərdi, hər öynənin yeməyini bişirərdi, yumurta sarısıynan nehrənin axıdan yerin yamayardı, iri teştdə özü demiş bir "tığ" paltar yuyardı, kömür ütünü yelləyib məktəbli paltarlarımızı ütüləyərdi, toyuq basdırardı, xəmir yoğurar, sac asıb çörək bişirərdi. Evin anamın qollarından keçməyən işi yox idi. Bir belə işin öhdəsindən gələn anamın bir dəfə iş başında üzünü turşutduğunu görmədim. Axşam olanda yorğunluğunu belə bildirərdi – nənənizin qolları düşür! Hamı yerə girib işıq sönəndən sonra anamın rahatlıq tapdığına görə gecənin sahibinə şükür dolu duası eşidilərdi – gecəni xəlq edənə şükür! Səhər yenə hər şey təkrar olardı. Bunula belə yorğun düşən həmən qollar ilə anam bizi bağrına basmağa özündə güc tapardı. Allah anamı sevgi sarıdan yarıtmışdı – hər işi sevgiylə görərdi.

Anam Laçından (şəhərdən) qayıdanda onu gətirən maşın evimizin yanında 4-5 dəqiqə ləngiməliydi ki, ev üçün etdiyi bazarlıqlar maşından yerə düşürülsün. Qarpızı çox xoşlayırdı. Qarpız mövsümü olanda bazara apardığı məhsulu satandan sonra çoxlu qarpız alıb gətirərdi. Çırtmasıyla qarpızın yetişmişini kalından dəqiqliklə ayırardı. Kənd arvadları bazarda anamı güdürdülər, anam qarpız seçəndə başına yığışırdılar ki, onlara da qarpız seçsin. Anam alan qarpızlar bal kimi çıxardı. Atam qarpız tanıyan deyildi, ona görə də alanda pərt olmasın deyə kəsdirib alardı.

Evdə yükün, yastıqların üstünə açılmış quş, su pərisi və gül şəkilli hörməli tikmələr vardı. Hamısı özünün əl işləri olan bu tikmələri anam biz dünyaya gələnə qədər (çoxunu da qız vaxtı) tikmişdi. Tikmədə qarşı-qarşıya duran quşlar sevgililərin rəmzi idi. Biz Həkəri çayının yanında təkevli olurduq. Qonum-qonşu uzaq idi. Evin böyük uşağı kimi anamın yorğan-döşək salma-

sından tutmuş sac asıb çörək bişirməsinə qədər hər işdə ona kömək etməli olurdum. Axşam anam inəkləri sağıb qurtarana qədər mən də keçiləri sağardım. Ən gözümə duran iş bəkməz (tut doşabı) bişirəndə olurdu – mən əvvəldən axıra anamın yanında olmalıydım, çünki bəkməz bişəndən sonra tiyanı ikimiz yerə qoyurduq. Nənəm bu vaxt oynamağa getmək üçün darıxdığımı bilirdi, ona görə də mənə maraqlı bir şey alacağını vəd edib al dilinən məni getməyə qoymazdı. Qapımızda o qədər toyuq olurdu ki, nabələd adamlar (ən çox da ermənilər) görəndə elə bilirdilər həyətimiz toyuq fermasıdır. Ən çətin işim tövlənin dar şiferinin altıyla sürünüb toyuqların yumurtasını yığmaq idi. Bəzən toyuqların yumurtladığı yeri bilmirdik. Bir də yazağzı görürdük ana toyuq qırtdıya-qırtdıya yanında da cücələri şiferin altından yerə tökülürlər – belə olanda anam gülə-gülə ətəyini açıb cücələri tutardı ki, əzilməsinlər. Səxavətli idi. Gəlin köçən qohum qızların cehiz payında anamdan ya bir yorğan, ya bir yastıq, ya da başqa bir əl işi olardı – üstündə də qırmızı lenti. Əli xeyirli idi, təzəbinə olan gəlinlərə həyətdən toyuq damazlığı verərdi. Təmizkar idi, Laçında bizi tanıyan bir çox ziyalı ailələr anamın süd-qatığının, pendirinin müştərisi idilər.

İndiki ağlımla başa düşürəm ki, mən balaca olanda anamın dilmancı olmuşam. Atam evdə olmayanda evimizə tərəf səslənib atamı soruşan yaşlı kişilərə cavab vermək üçün anam yaşmaqlanandan sonra mənim qolumdan tutub həyətə çıxırdı. Anam atamın harada olduğunu və ya soruşan olanda tapşırdığı sözü pıçıltıyla mənə, mən də ucadan gələn adama deyirdim. Yaxın, doğma adam olanda anam pıçıldayırdı ki, evə dəvət elə, denən gəlsin çay içsin. Qəndin tapılmadığı, qıt olduğu vaxtlar tut qurusuyla həmərsin (itburnu) çayı evimizdə həmişə olardı.

Anam çox dilavər qadın idi. Adını yaza bilmədiyi halda danışanda natiq kimi danışardı, çaşmazdı. Həmişə atamın qarasına deyinərdi ki, Allah məğmun yaradıb, dili-ağzı yoxdu, bir yerdə dərdimizi deyə bilmir. Mən dilavərlikdə anama yox, məğmun, dili-ağzı olmayan atama oxşamışam. Hərəkətlərimdən, danışığımdan həyatda özümə yer tapmayacağımı sanki duyurdu – halıma acıyan nəzərlərlə mənə baxıb deyirdi – tükü yatımına darayarlar. Və mən bu günə qədər hələ də tükü yatımına daramağı öyrənə bilmədim.

Anamın həm yazıçı təxəyyülü, həm də güclü yumor hissi vardı. Baş verən hadisəyə özünəməxsus qiymət verər, ad qoyardı. Atamın evdə nagahan (qəfildən) bizə bəlli olmayan səbəbdən bığı qaçanda anam üzünü bizə tutub deyərdi – Allah bilir dədənizin (ailədə anama nənə, atama isə dədə deyirik) hansı toyda oynadığı qız yadına düşdü. Bu sözdən sonra atam dodaqlarını nə qədər bərk sıxsa da, xeyri olmazdı, o da bizə qoşulub ürəkdən gülərdi. Bəlkə də atam bığı qaçan an tamam başqa şeyi xatırlayırdı,

amma, anamın onun düşdüyü vəziyyət üçün dediyi fikir gözəl yaraşırdı. Simfonik orkestrin konserti başlayanda gülə-gülə deyərdi – quxnuda (mətbəxdə) mis qab-qacaq hamısı bir-birinə dəydi. Qızılca qadınları həmişə öz aralarında anamın pünhan dediyi bu sözü xatırlayıb gülürdülər – Allah bir dəfə də doğmağı kişilərə versin, nə çəkdiyimizi bilərlər! Laçın işğal olandan sonra çağırdığı bayatılar şairliyinə imza atıb təsdiq edəcək gücdədi:

*Laçın, səni kim yıxdı?*
*Pis gözüynən kim baxdı?*
*Kimlər sənə od vurdu,*
*Tamaşana kim çıxdı?*

*Mən aşıq, "haşa" deyim,*
*Dərdimi daşa deyim.*
*Tək Laçını demirəm,*
*Şuşaynan qoşa deyim.*

*Qayada qarmağım var,*
*Tutmağa barmağım var,*
*"Laçın" deyib Allaha*
*Gündə yalvarmağım var.*

Dəqiq bilirəm, şairliyim və güclü yumor hissim anamdan gəlmədi. Atamın bəzən məni qınayaraq "südünə çəkmisən" dediyi fikir burada dəqiq öz təsdiqini tapır.

Anam çox həssas idi. Həkəri çayının qırağında yol idarəsinin 2 otaqlı kəllayı-dolayı gözətçi evində olurduq. Hələ o vaxt biz olan yerə işıq çəkilməmişdi. 4-də oxuyurdum. Qış gecəsi, hamı o biri otaqda yatanda mən bu biri otaqda tək lampa işığında Mayn Ridin "Başsız atlı"sını oxuyurdum. Zeb Satampın üfüqdə gedən başsız atlını görməsi yerini oxuyub səhifəni çevirəndə illüstrasiyada həmin mənzərənin şəklini görüb pəncərəyə baxdım. Lampa işığının fonunda gözümdəki başsız atlı şəkli pəncərədə hərəkətə gəldi. Qorxudan qaçaraq bu evdən o biri evə təpildim. Anam cəld qalxıb mənə su içirtdi və dolayısıyla hər iki başı da atama çatan yağlı bir söyüş söydü. Bu gün də mənə sirdi – anam qaranlıqda mənim qorxduğumu nədən duydu?!

Kasıb olsaq da, anamın evdə həmişə ətri olardı. Ətir vuran kimi bilirdim ki, atamla toya gedəcəklər. O dövrün balaca uşaqları kimi mən də ölürdüm toya getməkdən ötrü. Ağlasam da, xeyri olmazdı, aparmırdılar (özü də bu ağlamaq ancaq anamın səmtində olurdu, atam tərəfdə ağlamaq təhlükəli idi).

Bəzən böyüklərin toya gedəcəklərini bir gün qabaqdan bilirdim və bir gün əvvəldən gözümün qorasını axıdırdım, amma, yenə xeyri olmurdu. Məndən balacaların isə bu vaxt heç cınqırı da çıxmazdı, ağlamağa ürək eləmirdilər – yəni İlhamı aparmırlarsa, bizim heç ağlamağa da haqqımız yoxdu mənasında. Əgər məni aparmağa razı olsaydılar, mən kiriyirdim, ağlamaq növbəsi məndən sonrakı uşağa çatardı. Anam toyda havanın yatımına, ritminə uyğun çox gözəl rəqs edərdi. Qızılca toylarında anamı ya dayısı, ya da Həvva mamamın (atamın bacısı) əri: "Qəhrəmanovun xanımının havasını çalın", – deyib aşıqlara sifariş edərdilər. Anam oynayanda toydakı çayçı, aşpaz xanımlar da "Səlbi oynayır" deyib mağara axışardı. "Dilin can incidəndir", köhnə "Tello", "Sarıköynək", "Meşəbəyi" (atamla oynayırdı) "Nazik əllər", anamın toylarda oynadığı havalar idi.

Balaca vaxtı axşamlar anam ağzında dınqıdı ilə bir çox havanı çalıb uşaqları oynadardı. Belə axşamlarda qohum uşaqları da bizdə olanda lap aləm olurdu. Çırıqqı (çapan, çırtıq) vuranlar çox olduğu üçün ev əsl toy mağarına dönərdi. Arada anam özü də qalxıb bizə qoşular – qol götürüb oynayardı. Təkevli olduğumuz üçün toy, aşıq görməyən uşaqları anam bu yolla gələcək xeyir məclislərinə təlim edirdi. Anamın dınqıdısı evimizə işıq (elektrik xətti) çəkilənə, atam üstündə val oxudan radio alanadək davam etdi.

Anamda tanıdığı və dinlədiyi bəzi maraqlı, gülməli adamları dəqiqliklə yamsılamaq qabiliyyəti (indiki dilnən parodiya etmək) vardı. Qohumlar bizə gələndə anamdan həmin adamlardan birini yamsılamağı xahiş edərdilər. Anam başlayanda gülüşmə düşərdi.

Birinci sinifdə oxuyanda müəllimimiz mənə su qıjısı gətirməyi tapşırmışdı. Evə girən kimi ilk sözüm bu oldu – nənə, müəllim qıjı istədi, məhlim müəllim yemək yeyir?! Anam körpəliyimin avamlığına gözləri yaşarınca gülmüşdü. Və anamın göndərdiyi qıjı bağlançasını məndən qəbul edəndə müəllimin də adi bir insan olduğuna hələ də inanmağım gəlmirdi.

Anam bişirdiyi yeməklər çox dadlı olardı. Dəndolmasını (yalançı dolma) o qədər dadlı bişirərdi ki, dadı damaqdan getməzdi. Özündən yeməklər kəşf edərdi. Şüyüdlü bir yemək bişirib adına "cürcənə" deyərdi. Qışda çay balığını şoraba suyunda soyutma eləyərdi – yeyərdin, doydum deməzdin. Atam evdə olmayanda bizim üçün ya sobada, ya da orta ocaqda hinduşka kababı bişirərdi. Çox hazırcavab idi. Acıyan vaxtımızda yeməyə nə var deyə soruşanda anam bişirdiyi yeməyin adını deyərdi. Əgər uşaqlardan biri o yeməyi xoşlamadığını desə, anam belə deyərdi – sən mizvərə gəzirsən, o da yoxdu. Bu gün də mizvərənin konkret hansı təam olduğunu ailəmizdə heç kim bilmir, amma, bilirik ki, o nədirsə, bizim əlimiz çatan deyildi, bugünkü dilinən desək, delikates kimi bir şey.

Mənə görə hər bir insanın təbiətdə bir ağac bənzəri var. Bu mənada nədənsə, atamı sərt dağdağan ağacına, anamı isə zərif şaftalı ağacına oxşadıram. Anam da şaftalı kimi bəstəboy idi, yanaqlarında şaftalı çəhrayısı (həm çiçək, həm meyvə) vardı, barmaqları şaftalı yarpağı kimiydi – bir üzü yumşaq, şümal, o biri üzü cod, qəlbi şaftalı kimi kövrək idi. Anam da saçını şaftalının meyvəsində olduğu kimi ortadan tağ ayırardı. Anam da yarpaqlamış şaftalı ağacı kimi yumru idi. Yaxın qohumları və anama ərki çatan rəfiqələri məndən anamı bəzən belə xəbər alırdılar – Yumru nətərdi?

Anam isti sevən idi, tərs kimi soyuq fəsildə torpağa qoyduq. Allaha ağır getməsin, bu da bir ağrımız oldu. Laçında qış olanda lap tezdən durub sobanı çatardı, çaydanın zümzüməsinə biz oyananda evimiz təndir kimi olardı.

Körpəlikdən yetim qalan anamgil üç bacı, bir qardaş idilər. Qardaşları əsgərlik etdiyi Tuva Respublikasının Kızıl şəhərində yaşayırdı. Laçına 2 dəfə gəldiyi yadımdadı. 20 Yanvar hadisələrində isə ölüm xəbəri gəldi. Böyük xalamgildə yası oldu. Dayım anamın and yeri idi – pul istəyəndə "Şəmşəddin dayının tək canı üçün..." deyəndə inanırdıq ki, pulu yoxdu. Bakıya gedəndə atam xərcliyimi verəndən sonra anam əlini qoynuna salıb pul düyünçəsini çıxardardı, düyünçədəki pulun çoxunu atam verən pulun üstünə əlavə edərdi.

Uzun müddət qaldığım yerdən (Bakıdan, əsgərlikdən) Laçına dönəndə aralıdan məni görən atam sevinsə də, yerindən tərpənməzdi, amma, anama xəbər edərdi, anam isə məni görən kimi sağ əlini sol döşünə çırpıb qabağıma yüyürərdi. Çatanda qollarını açıb məni bağrına basardı, duz kimi yalayardı. Sonra da yaylığının küncünü qaldırıb sevincdən gözünün yaşını silərdi. Yerindən tərpənməyən atamın qarasına deyinirdi ki, uşağına istəyini də bildirə bilmir. Anamı daha çox bu məqamda xatırlayıram – sağ əlini sol döşünə çırpıb üstümə qaçan!

Dilindən duası əskik olmazdı, həmişə balaları üçün dua edərdi – İlahi, özün balalarımı qanadının altında saxla! Qadan nənənə gəlsin! Nənən qadalarını alsın! Nənən ayağının altında ölsün! Nənən çiynində məzara getsin! Canım qurban! Anamın belə bir duası da vardı Allaha – az ağrı, asan ölüm! Dediyi kimi də oldu – evdə oturduğu yerdə qəfildən canını tapşırmışdı.

Öləndə facebookdakı səhifəmdə belə bir status paylaşdım: Ayaqqabım olmayanda "Yalın ayaqların gözümə girsin!", xəstələnəndə "İlahi, məni qapındakı itə hesab eylə!", bir yerim əziləndə "Nənəni daşa dönsün!" – deyən anam öldü. Məni belə sevən anam daşa döndü!

Və son olaraq – ölümündən keçən 2 il ərzində xəyalımdan çox keçirdim, amma, anama şeir yaza bilmədim!

**İlham QƏHRƏMAN**

**DÖYÜŞ XATİRƏLƏRİ**

# DAXİLİ QOŞUNLAR LAÇININ MÜDAFİƏSİ UĞRUNDA GEDƏN DÖYÜŞLƏRDƏ

Bədnam qonşularımız tərəfindən işğal edilmiş qədim yurd yerlərimizdən biri də Laçın rayonudur. Bu rayon "dənizdən-dənizə böyük Ermənistan" xülyası ilə yaşayan erməni daşnaklarının təcavüzkar siyasətinin acı nəticəsi olaraq 1992-ci ilin may ayının 18-də işğal olunub...

İşğal nəticəsində rayon sakinlərindən 264 nəfəri şəhid olmuş, 65 nəfəri girov götürülmüş, 103 nəfəri isə əlil olmuşdur. Erməni vəhşiliyi ilə bağlı doğma ata-baba ocaqlarını tərk etmək məcburiyyətində qalaraq respublikamızın müxtəlif şəhər və rayonlarına pənah gətirən laçınlı soydaşlarımızın vətən həsrəti, iyirmi ildən artıq vaxt keçməsinə baxmayaraq, bu gün də hər birimizin, hər bir azərbaycanlının qəlbini göynədir...

Laçın rayonunun bir sıra yaşayış məntəqələrinin, eləcə də yüksəkliklərin müdafiəsi uğrunda gedən döyüşlər zamanı Daxili İşlər Nazirliyinin Daxili Qoşunlarının şəxsi heyəti də fəal iştirak etmiş, erməni daşnaklarına sarsıdıcı zərbələr vuraraq, düşməni geri çəkilməyə məcbur etmişlər.

Bu döyüşlər zamanı qoşunların onlarla hərbi qulluqçusu şəhid olmuş, 4 nəfəri itkin düşmüş, 11 nəfəri isə yaralanmışdır.

Onu da qeyd etmək lazımdır ki, Daxili Qoşunların döyüş yolu tarixində özünəməxsus yeri olan və bu rayonun müdafiəsi uğrunda gedən hərbi əməliyyatlarda şəxsi heyətin göstərdiyi qəhrəmanlıqlar təəssüflər olsun ki, bu gün çox az adama məlumdur.

Beləliklə, Daxili Qoşunların vaxtı ilə Laçında yerləşən 15013 saylı hərbi hissəsinin tərkibində xidmət etmiş hərbi qulluqçularımızın – polkovnik Əhliman İlmazovun, polkovnik-leytenant Aydın Zahidovun, baş gizir Elşən Sadıqovun, eləcə də qoşunların veteranları; ehtiyatda olan polkovnik-leytenant Namaz Qasımovun və çavuş Rövşən Göyçəyevin burada gedən döyüşlərlə bağlı xatirələrini sizlərə təqdim edirik.

## ƏSGƏRLƏRİMİZ QƏHRƏMANCASINA VURUŞURDULAR…

İlk müsahibim vaxtı ilə baş leytenant hərbi rütbəsində Daxili Qoşunların Laçın rayonunun müdafiəsində iştirak edən hərbi hissəsinin komandirinin tərbiyə işləri üzrə müavini olmuş polkovnik Əhliman İlmazovdur. Aradan xeyli müddət keçməsinə baxmayaraq, polkovnik Ə.İlmazov o günləri yaxşı xatırladığını deyir: *"1992-ci ilin noyabrın 7-də taborumuz həyə-*


POLKOVNİK
ƏHLİMAN İLMAZOV

*can siqnalı ilə qaldırılaraq, Mingəçevirə, oradan da Ağdam – Ağdərə – Kəlbəcər yolu ilə Laçına gətirildi. O vaxt tabora kapitan Akif Məmmədov komandirlik edirdi. Biz burada bir gecədə postlarda mövqe tutan könüllü döyüşçüləri dəyişməli olduq. Bu döyüşçülərdən bəziləri hətta postu təhvil verəndə göz yaşlarını saxlaya bilmirdilər. Bizim sıralarımızda gənc, təcrübəsiz əsgərlər üstünlük təşkil edirdi. Onlar deyirdilər ki, ermənilər bizim postları gənc əsgərlərə təhvil verdiyimizi bilsələr, ürəklənib hücum edəcəklər. 500-dək könüllü döyüşçünü 200 nəfərə yaxın hərbi qulluqçu ilə dəyişərək postlarda mövqe tutub Fingə kəndinin müdafiəsində dayandıq. Bir həftədən sonra həqiqətən də qızğın döyüşlər başladı. Döyüşçülərimizin qəhrəmanlığı sayəsində bu hücumların qarşısını ala bildik.*

*Bizimlə Daxili Qoşunların Baş İdarəsi arasında demək olar ki, rabitə və ya digər hər hansı bir əlaqə yox idi. 1993-cü ilin yanvar ayında tərkibində o zaman qoşunların qərargah rəisinin müavini olmuş mayor Qabil Zamanovun, rəhmətlik polkovnik-leytenant Siyavuş Rüstəmovun, kapitan Bayram Xankişiyevin və leytenant Namiq Poladovun da olduğu Baş İdarənin bir qrup zabiti axtara-axtara gəlib bizi Laçında tapa bildilər. Bundan sonra taborumuz 15013 saylı hərbi hissə kimi yenidən formalaşmağa başladı. Bununla əlaqədar Təzəkənddə yerləşən qərargahımızda tədbir də təşkil olunmuşdu. Tədbirdə hərbi hissənin yaradılması barədə müvafiq əmr şəxsi heyətə elan olunduqdan sonra, Baş İdarədən gəlmiş nümayəndələr tərəfindən döyüşlərdə fərqlənən bir qrup hərbi qulluqçularımız Daxili Qoşunlar Komandanı adından qol saatı və digər qiymətli hədiyyələrlə mükafatlandırıldı.*

*Təminatımıza gəlincə, bu o qədər də yaxşı deyildi. Bizim silahımız yalnız avtomatdan ibarət idi. Lakin sonradan düşməndən qənimət kimi əldə etdiyimiz bəzi silah növləri ilə müdafiəmizi nisbətən gücləndirə bilmişdik. Hərbi qulluqçuların qidalanmasının vəziyyəti də yaxşı deyildi. Ərzaq sarıdan çətinliyimiz daha çox idi.*

*Lakin bütün bunlara baxmayaraq, əsgərlərimiz qəhrəmancasına vuruşurdular. Vətən yolunda canından keçərək şəhid olmuş silahdaşlarımız da oldu...*

*Mən 1993-cü ilin mart ayınadək Laçında qaldım. Martın 8-də isə vəzifəmin dəyişməsi ilə əlaqədar Bakıya qayıtmalı oldum".*

## ŞƏXSİ HEYƏTİN DÖYÜŞ RUHU YÜKSƏK İDİ...


POLKOVNİK-LEYTENANT
AYDIN ZAHİDOV

O zamanlar leytenant hərbi rütbəsində bölük komandiri kimi xidmət etmiş polkovnik-leytenant Aydın Zahidov şəxsi heyətin göstərdiyi qəhrəmanlıqları unutmayacağını və Vətənimizin belə qeyrətli oğulları ilə qürur duyduğunu bildirdi: *"...Laçın rayonunun Fingə, Qozlu, Haqnəzər kəndlərinin və Sarıbaba dağının müdafiəsi uğrunda gedən döyüşlərdə Daxili Qoşunların şəxsi heyəti əsl qəhrəmanlıqlar nümayiş etdirərək, erməni qaniçənlərinə layiq olduqları cavabı vermişlər.*

*Sarıbaba dağı bölüyümüz tərəfindən müdafiə olunan və hərbi-strateji cəhətdən mühüm əhəmiyyət kəsb edən məntəqələrdən biri idi. Belə ki, burada yerləşən postlarımızdan "Laçın dəhlizi"* (*Ermənistandan Dağlıq Qarabağa gedən qısa və əsas magistral yol Laçın rayonu ərazisindən keçdiyi üçün belə adlanır. Bu dəhlizin ermənilərin nəzarətinə keçməsi ilə ərazilərimizin işğalı prosesi sürətlənmiş oldu – A.Ə.*) *aydın görünürdü. Onu da qeyd edim ki, Sarıbaba dağındakı postlarımıza gedən yol Təzəkənddə yerləşən qərargahımızdan xeyli uzaqda və relyef baxımından çətin keçilə bilən məsafədə yerləşirdi. Bundan əlavə, şəxsi heyətin sayı nisbətən az olduğundan, müdafiə xəttini təşkil edən postlar arasındakı məsafə də geniş idi. Təbii ki, məsafənin xeyli uzaq olması və nəqliyyat vasitəsinin yoxluğu şəxsi heyətin təminatında bir çox çətinliklərə gətirib çıxarırdı. Ona görə də sursatların və ərzağın postlara daşınması əsgərlər tərəfindən piyada yolla həyata keçirilirdi. Lakin bu kimi çətinliklərə baxmayaraq, şəxsi heyətin döyüş ruhu olduqca yüksək idi. Düşmənin dəfələrlə Sarıbaba dağındakı postlarımıza etdiyi hücumların cəsur döyüşçülərimiz tərəfindən qətiyyətlə alınması bunu deməyə əsas verir. Bu baxımdan, qeyd etdiyim yaşayış məntəqələrinin, həmçinin bir sıra yüksəkliklərin müdafiəsi zamanı şəxsi heyətin göstərdiyi qəhrəmanlıqları hərb tariximizin şanlı səhifələri kimi qiymətləndirmək olar".*

## HƏR QARIŞI ŞƏHİD QANI İLƏ YOĞRULAN VƏTƏN TORPAĞI...

Baş çavuş Elşən Sadıqov da vaxtı ilə Laçının müdafiəsində dayanan hərbi hissəmizin tərkibində sıravi hərbi qulluqçu kimi xidmət edib (hazırda Daxili Qoşunlarda Dayaq rabitə qovşağının baş çavuşu – A.Ə.). Rayon ərazisindəki Sarıbaba dağının, eləcə də Ərikli, Qozlu, İpəkli və Fingə kəndləri-

nin müdafiəsi uğrunda erməni daşnaklarına qarşı döyüşüb. Baş çavuş E.Sadıqov Laçında vuruşaraq qəhrəmancasına şəhid olmuş döyüşçü yoldaşlarının xatirəsini heç zaman unutmayacağını, onların intiqamını erməni daşnaklarından almağa hər zaman hazır olduğunu bildirdi: *"...1992-ci ilin iyulunda müstəqil ölkəmizin vətəndaşı kimi həqiqi hərbi xidmətə çağırılmışam. Həmin il noyabrın əvvəllərində isə Daxili Qoşunların əsgəri kimi doğma Laçınımızın müdafiəsinə yollanmışam.*


BAŞ ÇAVUŞ
ELŞƏN SADIQOV

*Bir neçə gündən sonra rayonun Fingə kəndi yaxınlığında erməni təcavüzkarlarına qarşı ağır döyüşümüz oldu. Baş vermiş bu döyüşdə şəxsi heyətin qətiyyəti və güclü müqaviməti nəticəsində düşmən çoxsaylı tələfat verərək geri çəkilmək məcburiyyətində qaldı. Sonralar Laçının digər yaşayış məntəqələri və yüksəkliklərinin müdafiəsində iştirak etdim.*

*İştirakçısı olduğum bu döyüşlərdən mənim həyatıma ən çox təsiri olan Fingə kəndi yaxınlığındakı 10 nəfərlik postumuza düşmənin qəfil hücumu olub. Daşnakların bizdən qat-qat çox olmasına baxmayaraq, onlara qarşı güclü müqavimət göstərə bilirdik. Lakin döyüşlərin gedişində mövqelərimizin minamyot atəşinə tutulması nəticəsində 8 nəfər şəhid verməklə postu tərk etmək məcburiyyətində qaldıq... Döyüşdə bel nahiyəmdən yaralandığımdan İlham adlı əsgər yoldaşımın köməkliyi ilə birtəhər Qozlu kəndinə gətirildim. O dövrdə hərbi hissəmizin ayrıca tibb məntəqəsi yox idi. Bu baxımdan tibb məntəqəmiz sakinləri tərəfindən tərk edilmiş kənddəki evlərdən birində yerləşirdi".*

Bu arada baş çavuş E.Sadıqov Laçın döyüşlərindən tək xatirə olaraq saxladığı və burada vuruşan konüllülərdən ibarət Laçın taborunun döyüşçüləri ilə birgə çəkdirdiyi fotoşəkili mənə göstərir. Bir müddət fikirli halda şəkilə baxdıqdan sonra, yenidən sözünə davam edir: *"...Hərbi qulluqçularımızın bir çoxu Laçının müdafiəsi zamanı qəhrəmancasına həlak oldu. Səngərlərdə şəhid olmuş döyüşçü yoldaşlarımın səsləri bu gün də qulaqlarımdan getmir... Bakıdan Ağabala İbrahimov, İlham Məmmədov, Kürdəmirdən Rauf Misirov, Hacıqabuldan Əzizağa Əsədov, Naxçıvandan Babək (soyadını unudub – A.Ə.) və Zaqataladan Samir Süleymanov məhz belə döyüşçülərimizdəndir.*

*İnanıram ki, hər qarışı şəhid oğullarımızın qanı ilə yoğrulmuş müqəddəs Vətən torpaqlarının azad ediləcəyi gün uzaqda deyil. Şəhidlərimizin intiqamını mənfur düşmənlərimizdən almağa, işğal olunmuş torpaqlarımızın azad edilməsi uğrunda bu gün də döyüşməyə hazıram...".*

## ƏN AĞIR DÖYÜŞÜMÜZ TƏZƏKƏNDDƏ OLDU...



RÖVŞƏN GÖYÇƏYEV (VETERAN)

Daxili Qoşunların veteranı, Şamaxı rayonunun Poladlı kənd sakini (hazırda bu kənd Qobustan rayonunun tərkibindədir – A.Ə.) Rövşən Göyçəyev o dövrdə çavuş rütbəsində qoşunların Laçının müdafiəsində dayanan 15013 saylı hərbi hissəsində taqım komandiri kimi xidmət edib. Hərbi hissənin yaranması ilə əlaqədar Təzəkənddəki qərargahda təşkil edilmiş mərasimdə Daxili İşlər Nazirinin müavini, Daxili Qoşunların Komandanı adından qol saatı ilə mükafatlandırılmış cəsur döyüşçülərimizdən biri də məhz Rövşən olmuşdur.

R.Göyçəyev indiyədək qoruyub saxladığı cib dəftərçəsini çıxarıb Laçında xidmət etdiyi dövrdə öz xətti ilə yazdığı qeydləri mənə göstərir. Dəftərçədə tabeçiliyində vuruşan əsgərlərin adlı siyahısı, ünvanları, eləcə də xronoloji ardıcıllıqla baş vermiş döyüşlər barədə qiymətli məlumatlar qeyd olunub:

“**... 07 noyabr 1992-ci il.** Həyəcan siqnalı ilə Mingəçevirə, oradan da Laçına yola düşdük.

**10 noyabr 1992-ci il.** Axşam Fingə kəndinə gəldik. Noyabrın 11-də bizi İpək-1 kəndinə, oradan da Sarıbaba dağına gətirdilər.

**19 noyabr 1992-ci il.** Saat 10:00-da ermənilər bizim mövqelərə hücum etdilər. Döyüş axşam saatlarınadək davam etdi. Biz bu döyüşdə dəqiq sayı yadımda deyil, təxminən 8-10 nəfərədək şəhid verdik. Bir o qədər də döyüşçü yoldaşımız müxtəlif dərəcəli güllə yarası aldı. Həmin axşam biz Qozlu kəndinə geri çəkilməli olduq.

**23 noyabr 1992-ci il.** Haqnəzər kəndi ətrafındakı yüksəkliklərdə yerləşən postlarımızda mövqe tutduq.

**24 noyabr 1992-ci il.** Mən və bir neçə əsgər yoldaşım baş leytenant Əhliman İlmazovun rəhbərliyi ilə Haqnəzərdən Qozluya qayıtdıq. Məqsəd buradakı postlarımızdan birini əldə saxlamaq idi. Lakin həmin vaxt ermənilər Qozlu kəndini müxtəlif növ silahlardan, o cümlədən minamyotlardan güclü atəşə tutduğundan, burada az bir qüvvə ilə qalmaq mümkün olmadı. Düşmənlə müqayisədə bizim silahımız yalnız avtomatlardan ibarət idi. Ermənilər isə silah və texnika sarıdan bizdən qat-qat üstün idi. Bizim isə yaralı əsgərimizi hospitala aparmağa belə maşınımız yox idi. Bu səbəbdən biz yenidən Haqnəzər kəndinə qayıtmalı olduq. Lakin bir müddət sonra Haqnəzər kəndi də düşmənin güclü hücumuna məruz qaldı. Təpədən-dırnağadək silahlanmış düşmənin hücumu qarşısında 25.11.1992-ci il tarixdə döyüşə-döyüşə Təzəkənd istiqamətində geri çəkilməyə məcbur olduq”.

Laçında iştirakçısı olduğu döyüşlərin içərisində ən ağırının məhz Təzəkənddə baş verdiyini deyən Rövşən əsgərlərimizin qətiyyəti nəticəsində düşmənin xeyli itki verərək geri çəkildiyini bildirdi: *"...Təzəkənddə Daxili Qoşunlardan əlavə, könüllülərdən ibarət olan Laçın taboru da yerləşmişdi. Bizdən fərqli olaraq, Laçın taborunun döyüş əməliyyatlarını müvəffəqiyyətlə aparması üçün lazım olan silah və hərbi texnikası vardı. Bir sıra döyüşlərdə düşmənin məğlub edilərək geri çəkilməsində bu taborun bizə (Daxili Qoşunlara – A.Ə.) dəstəyi böyük olmuşdur. Yaxşı yadımdadır, 1992-ci ilin noyabrın 29-da ermənilər Təzəkənd istiqamətində bizim mövqelərə yenidən hücuma keçmişdi. Məhz bu taborun bizə dəstəyi nəticəsində daşnaklar bu dəfə də xeyli itki verərək geri çəkilmək məcburiyyətində qaldılar. Bu məğlubiyyətin əvəzini çıxmaq üçün qarşıdakı günlərdə düşmən dəfələrlə bizim mövqelərə hücum çəksə də, şəxsi heyətin qəhrəmanlığı sayəsində hər dəfə də burunları ovularaq geri çəkilməyə məcbur olurdu.*

*Təzəkənd istiqamətində ən şiddətli döyüşlər isə 1993-cü il yanvarın 5-də səhər saat 7-də başladı. İki gün gecə-gündüz davam edən bu döyüşlərdə düşmən qüvvə baxımından bizdən xeyli üstün olsa da, Daxili Qoşunların və Laçın taborunun döyüşçülərinin birgə fəaliyyəti nəticəsində ermənilər canlı qüvvə və texnika sarıdan xeyli itki verdilər. Məğlub olmuş düşmən geri çəkilərkən Sarıbaba dağının ətəyində bir tankı və xeyli sayda canlı qüvvəsi məhv edildi. Onu da qeyd edim ki, döyüşlər gedən müddətdə əsgərlərimiz iki gün ac qalmalarına baxmayaraq, hər biri qəhrəmancasına vuruşurdular.*

*Mənim taqımımın əsgəri, snayper Saleh Hüseynov bu döyüşdə 9 erməni yaraqlısını öldürmüş, 7-ni isə yaralamışdır. Bu döyüşdən sonra onun igidliyi və şücaəti nəzərə alınaraq manqa komandiri təyin edilmişdi.*

*Ümumiyyətlə, Laçında gedən bir sıra döyüşlərdə taqımımın fərqlənmiş əsgərlərindən Şamaxıdan Mübariz Əliyevin, rayonun Məlikçobanlı kəndindən Asimin, Çölbağırlı kəndindən Hafiz Allahverdiyevin, Quşçu kəndindən Misir Hüseynovun, Balakənin Hənifə kəndindən Mübariz Şeyxovun, Şəkidən Arazın, bu rayonun Qoxmuq kəndindən Vüqar Qədirovun, Göyçay rayon Hacalı kəndindən Əhliman Salmanovun, Sabirabad rayon Şəhriyar kəndindən İlham Hüseynovun, həmin rayonun Minbaşı kəndindən Nizami Qəhrəmanovun, Tovuz rayonu Dondar-Quşçu kəndindən Bayram Paşayevin, Neftçala rayonu II Qaralı kəndindən Taleh Həsənovun, Biləsuvar rayonundan Saleh Hüseynov və Əhəd Bəyalıyevin, Bərdənin Məmmədli kəndindən Füzuli Əliyevin, həmin rayonun Yeni Əyricə kəndindən Ziya Hüseynovun, Lerikin Soru kəndindən Daşqın Abbasovun, Qusar rayon Urva kəndindən Polad Eyvazovun, Saatlının Smada kəndindən Gülalı Bədəlovun, Bakının Əmircan kəndindən Fəxrəddinin və Bakıxanov qəsəbəsindən Mehdi Xəlilovun adlarını qeyd edə bilərəm".*

Rövşənin cib dəftərçəsində diqqətimi çəkən ən maraqlı qeydlərdən biri də 1993-cü il martın 26-da Təzəkənddə taqımın hər bir döyüşçüsü üçün yazılmış 14 bəndlik şeir oldu (Şeirdə adları qeyd olunan, həmçinin Rövşənin döyüşlərdə hər zaman fərqlənmiş əsgərlər kimi xatırladığı Saleh Hüseynov və Əhəd Bəyalıyev sonralar Füzuli istiqamətində gedən döyüşlərdə qəhrəmancasına şəhid olmuşlar – A.Ə). Şeirin iki – ilk və son bəndlərini sizə təqdim edirəm:

***Biz Fingədə qardaş olduq,***
***Təzəkənddə qardaş olduq.***
***Ermənidir düşmənimiz,***
***Vuruşuruq ürəklə biz.***

***Bir-bir keçir günlərimiz,***
***Qardaş olduq beş ayda biz.***
***Biz möhkəmcə dostlaşmışıq,***
***Sanki bir anadanıq.***

R.Göyçəyev martın 12-dən 25-dək on nəfər əsgər yoldaşı ilə birgə məzuniyyətə buraxıldığını, Laçına qayıtdıqdan sonra burada qızğın döyüşlərin getdiyini bildirdi: *"...1993-cü il martın 24-də biz Yevlaxa, 25-də isə oradan helikopterlə Laçına gəldik. Artıq Laçında qızğın döyüşlər başlamışdı. Martın 27-dən 31-dək Təzəkənd uğrunda qanlı döyüşlər oldu. Bu döyüşdə taqımımın əsgəri Taleh Həsənov düşmən snayperinə tuş gələrək topuğundan yaralandı. Martın 31-i gecə saat 00:15-də bizə ermənilərin Kəlbəcəri işğal etməklə "Tunel yolu" (Sıldırım qayaların altından keçən və 180 metr uzunluğu olan bu tunel Kəlbəcərin 35 kəndini rayon mərkəzi ilə birləşdirən yeganə avtomobil yolu idi – A.Ə.) deyilən ərazini tutduqlarını və bununla da mühasirəyə düşdüyümüzü bildirdilər. Bundan sonra gecəykən ayrı-ayrı qruplar şəklində ərazini tərk etməli olduq. Onu da qeyd edim ki, hərbi hissəmizin qərargah rəisi olmuş baş leytenant Namaz Qasımovun özü də Laçını ən son tərk edən belə qruplardan birinin tərkibində idi. Bizim 3 nəfərlik qrup Murov dağı istiqamətində təxminən bir sutka yol qət etdikdən sonra Kəlbəcər rayonunun əhalisi tərk edilmiş kəndlərindən birinin girəcəyinə çatanda yaxınlıqdakı evlərin birindən səs eşitdik. Yaxınlaşıb diqqətlə qulaq asanda evdə olanların azərbaycan dilində danışıqlarından bildik ki, hərbi hissəmizin əsgərləridir. Yaxınlaşanda gördük ki, baş leytenant N.Qasımov 7-8 nəfər hərbi qulluqçumuzla buradadır. O, ayaqları şişdiyindən bizə artıq yeriməyə taqətinin olmadığını və burada qalmaq istədiyini bildirərək göstərdiyi istiqamətdə getməyimizi təkid etdi. Lakin, bizim ona: "Komandir, sizsiz heç yerə gedən deyilik!" – deyə sözümüzdə israr etdiyimizi görüb hamımızın birlikdə gedəcəyimizə razı sala bildik. Bundan sonra baş leytenant N.Qasımovla birgə 6 sutka ac-susuz, şaxtalı havada, gecə-gündüz qarlı-palçıqlı yollarla Murov dağına, oradan isə Xanlar rayonuna (indiki Göygöl rayonu – A.Ə.) gəldik...".*

## EŞİTDİKLƏRİMƏ İNANA BİLMİRDİM...


e.o. polkovnik-leytenant
NAMAZ QASIMOV

O zamanlar baş leytenant hərbi rütbəsində 15013 saylı hərbi hissə komandirinin 1-ci müavini – Qərargah rəisi olmuş Namaz Qasımovun (*hazırda Daxili Qoşunların veteranı, e.o. polkovnik-leytenant – A.Ə.*) fikirləri məhz qoşunların döyüş yolu tarixində mühüm yeri olan Laçın döyüşləri barədə geniş təsəvvür yaradır.

Daxili İşlər Nazirinin müavini, Daxili Qoşunlar Komandanının müvafiq əmri ilə 1993-cü ilin yanvar ayında bu vəzifəyə təyin olunduğunu deyən N.Qasımov həmin ilin aprel ayının əvvəllərinədək, yəni hərbi hissə ləğv edilənə qədər bu vəzifədə xidmət etdiyini bildirdi: *"...Düzdür, aradan xeyli müddət keçsə də, Laçınla bağlı xatirələr heç zaman yaddaşımdan silinməyib. Laçına yola düşməyimiz, şəxsi heyətin erməni silahlılarına qarşı fədakarcasına vuruşması, nəhayət, Kəlbəcər ərazisindən keçən yolun daşnakların nəzarətinə keçməsi nəticəsində düşmən əhatəsində qalan bölmələrimizin mühasirəni yararaq oradan çıxması və s. Yaşadığımız o ağrılı-acılı günlər indi də xatirimdədir...*

*Yaxşı yadımdadır, 1993-cü ilin yanvar ayında Daxili Qoşunların Biləcəri qəsəbəsində yerləşən hərbi hissəsindən 40 nəfər sıravi döyüşçü ilə birgə Hacıqabuldakı hərbi hissəyə gəldik. Oradan da 2 baş atı xizəklə birlikdə maşına yükləyib Ağdərə rayonunun Ortakənd kəndinə yola düşdük. Bura çatdıqdan sonra, Ağdərə – Kəlbəcər yolu ilə Laçın istiqamətində hərəkətimizi davam etdirdik. Sumqayıtdakı hərbi hissədə xidmət edən və əslən Kəlbəcər rayonunun Mollabayramlı kəndindən olan sıravi İsmayıl İsmayılovu gedəcəyimiz yola bələdçilik etməsi üçün özümüzlə aparırdıq. Həmin yolda maşın karvanımız iki dəfə düşmən atəşinə məruz qalsa da, biz təkidlə yolumuza davam edirdik. Nəhayət, gecə saat 02:00-da Kəlbəcər rayonuna gəlib çatdıq. Güclü qar yağdığından maşın karvanının Laçın rayonunun Təzəkənd istiqamətində irəliləməsi çətinləşmişdi. Kəlbəcər rayon icra nümayəndəsinin köməkliyi ilə ayrılmış traktorla yol qardan təmizləndikdən sonra maşın karvanı təyin olunmuş yerə gəlib çatdı".*

Veteran silahdaşımız Kəlbəcərdən keçən yolun tutulması ilə əlaqədar düşmən mühasirəsində qalan bölmələrimizin Laçındakı mövqeləri tərk etmək məcburiyyətində qaldıqları o ağrılı-acılı günləri heç zaman unut-

mayacağını bildirdi: *"...1993-cü ilin martın 28-də hərbçilərimiz Təzəkəndə sursat və ərzaq təminatını gətirmək üçün Kəlbəcərin Kürdhacılı kəndinə getdilər. Həmin günün axşamı idi, təqribən saat 22 olardı. Tabor komandirimiz kapitan Akif Məmmədov mənimlə rabitə əlaqəsi saxlayaraq Müdafiə Nazirliyinin Kəlbəcərdə olan hissəsinin Kürdhacılı kəndindən çıxdığını və bu rayona köməyə getdiyini bildirdi. Mən eşitdiklərimə inana bilmirdim. Belə çıxırdı ki, bizim Laçındakı mövqelərimiz düşmən mühasirəsinə düşüb. Dərhal ikimizin arasında olan parolu soruşdum. O, parolu dedikdən sonra səngərləri tərk etməyimiz barədə əmr verdi. Bununla yanaşı, sağ və sol cinahlarımızın boşalması barədə məni məlumatlandırdı. Beləliklə, Kəlbəcərdən keçən yolun ermənilərin nəzarətinə keçməsi ilə əlaqədar bizim Laçında müdafiə olunan bölmələrimiz düşmənin mühasirəsinə düşmüş oldu...*

*Hissə komandirinin əmrinə əsasən, mən bölük komandirlərinə müvafiq tapşırıqları verdim. Beləliklə, 29.03.1993-cü il tarixdə saat 03-də Vağazin kəndi istiqamətində 4 dəstəyə bölünərək hərəkətə başladıq. Saat 12 radələrində Zavod deyilən kəndə gəlib çatdıq. Bizim qərargahımız artıq bu kənddə yerləşirdi. Tam tərkibdə gəlməyimiz barədə hissə komandiri kapitan A.Məmmədova məruzə etdim. Növbəti duracaq yerimizin Laçının Kəlbəcər istiqamətində yerləşən Ərikli kəndi olacağı barədə tapşırıq verildi. Biz bir neçə saatdan sonra Ərikli kəndində mövqelərimizi tutduq. Düşmən bizi təqib edirdi. Piçənis kəndində Müdafiə Nazirliyinin Laçın alayının şəxsi heyəti onların qarşısını döyüşərək aldılar. Ərikli kəndindən gecə saat 04-də (30.03.1993-cü il tarixdə) Kəlbəcər istiqamətində hərəkətə başladıq və axşam tərəfi Kəlbəcər rayonunun Zülfüqarlı kəndinə gəldik. Martın 31-də bu kənddə olarkən bizə məlumat verdilər ki, "Tunel yolu" ermənilər tərəfindən tutulub. Axşam komandirimiz toplantı keçirtdi və yaylaq yolu ilə çıxmağımıza qərar verdi. Biz Qoçdaş deyilən dağın zirvəsinə çatanda Kəlbəcər şəhərinin od-alova büründüyünü gördük. Mühasirədə olduğumuzu və getdikcə həlqənin daraldığını açıq-aydın hiss edirdik. Quzeyçirkin kəndində bir neçə saat dayanmağı qərara aldıq. Kəşfiyyat-gözətçi qrupu Kəlbəcər – Ağdərə yolunu yoxlamaq üçün müşahidə aparmağa göndərildi. Müşahidənin nəticələri aydın olduqdan sonra Qamışlı körpü düşmən tərəfindən nəzarətə götürüldüyünə görə Çaylı və Qılınclı kəndini keçib Nadirxanlı kəndindən Murovdağ tərəfə qalxmağa məcbur olduq. Nadirxanlı kəndi ətrafında iki dəstəyə bölündük. Daşkəsən istiqamətində gedən birinci dəstəyə kapitan A.Məmmədov, Murovdağ istiqamətində hərəkət edən digər dəstəyə isə mən rəhbərlik etməli oldum...*

*Biz aprelin 4-də Daxili Qoşunların Gəncə şəhərində yerləşən N saylı hərbi hissəsində görüşdük. Daxili Qoşunlar Komandanının 15013 saylı*

*hərbi hissəsinin ləğv edilməsi barədə müvafiq əmri hərbi hissəyə daxil olduqdan sonra hissəmizin şəxsi heyətini və silah-sursatını qoşunların Gəncədə yerləşən hərbi hissəsinə təhvil verdik...”.*

Beləliklə, Daxili İşlər Nazirliyinin Daxili Qoşunlarının Laçının müdafiəsi uğrunda 1992-ci ilin noyabrın 7-dən etibarən başlayan döyüş yolu, çox təəssüflər olsun ki, 1993-cü il martın 31-də Kəlbəcər rayonu ərazisindəki “Tunel yolu” deyilən ərazinin erməni daşnaklarının əlinə keçməsi nəticəsində Laçında döyüşən bölmələrimizin düşmən mühasirəsini yarıb çıxması ilə sona çatmış oldu...

Məlumat üçün qeyd edək ki, Daxili Qoşunların arxivində saxlanılan “1992-1994-cü illərdə Daxili Qoşunlar üzrə şəhid olmuş hərbi qulluqçuların siyahısı”nda 4 nəfər, “1992-1994-cü illərdə döyüş əməliyyatları zamanı itkin düşmüş hərbi qulluqçuların siyahısı”nda 4 nəfər, həmçinin “1992-1994-cü illərdə gedən döyüş əməliyyatları zamanı yaralananların siyahısı”nda isə 13 nəfər hərbi qulluqçumuzun Laçın rayonunun müdafiəsi uğrunda gedən döyüşlərdə iştirak edərək şəhid olması, itkin düşməsi və yaralanması faktları öz təsdiqini tapıb.

İnanırıq ki, digər tarixi yurd yerlərimiz kimi, doğma Laçınımız da düşmən tapdağından azad ediləcək, laçınlı soydaşlarımız öz ata-baba torpaqlarına qayıdacaqlar...

**Anar ƏHMƏDOV,**
***Daxili Qoşunların zabiti, kapitan***

## KİMLƏR KEÇDİ BU DÜNYADAN

### QƏRIB, SUSQUN MƏZAR...



Heç sevmədim şəkillər həkk olunmuş məzar daşlarını... Bu dünyaya lal-dinməz daşlardan baxan kədərli üzləri, donuq baxışları...

Ölümün ən ağır yükü bir insanın qəbiristanlıqdan boylanan məzarlarını seyr etməkdir.

Həmişə demişəm, mənə elə gəlir ki, yer üzündən bir qərib, elsiz insan köçəndə bu şəhərdə soyuq yellər əsir. Hansı fəsil olursa olsun, havada bir sazaq dolaşır.

Bəlkə də həmin gün o insanın dəfn edilməsi gərəkən doğma torpağının harayı, buludların göz yaşı üşüdür məni. Adil müəllim də bu həyatdan köçəndə ölümün havasından içim titrəmişdi.

Doğmalarımı itirdikcə ürəyimin hüznü ağrıdır məni.

Dəfn edə bilmədiyim bir Vətənim, gözü yollarda qalıb ölən vətənsizlərim o qədərdir ki... Qərib insanların məzarları olmur heç vaxt, qürbətdə əmanət qoyulurlar torpağa. Onların tabutlarını əzizləri ürəklərində gəzdirirlər ölənə qədər...

Adil müəllim sakit, səssiz getdi bu həyatdan. Heç kimi incitmədən, əziyyət vermədən.

Vətənsizliyə, köçkünlüyə, yataqxana həyatına, yaşadığı hər şeyə küsdü. Ürəyinin yükünü elə evinə baxa-baxa göylərə təslim etdi.

Son nəfəsində ağlına nələr gəldi, qəlbindən nələr keçdi. Atasını, anasını cavan yaşda dəfn etdiyi qardaş məzarına aparmağı arzuladı bəlkə də...

Bəlkə son dəfə qardaşını, bacısını, qızlarını, nəvələrini, möhkəm-möhkəm qucaqlayıb ürəyinin yükünü azaltmaq istədi.

Adil müəllimin ölümə təslim olduğu yerdən nə uca dağlar, nə yaşıl çəmənlər görünür. Kaş ki görünsəydi... Onda nəfəsi heç daralmaz, ürəyi dayanmazdı.

Dəyərli ziyalı, savadlı müəllim, gözəl ailə başçısı, yaxşı ata və sevimli baba... Ölümünlə hər kəsi sarsıtdın, kədərləndirdin.

Günay israrla səndən yazmağımı istəyir. Sözlərim yarasına nə qədər məlhəm olacaq bilmirəm...

Amma onu bilirəm ki, sənin xiffətindən ürəyi hər an parçalanır. Günay övlad yarasını başını sənin çiyninə söykədiyi zaman unutduğu üçün, indi ona daha çətindi.

Hələ yarası təzədi, qaysaq bağlamayıb. Ölümünlə barışmır deyə, gözünün yaşı qurumur. Mən onun ağrılarını bilirəm, duyuram. Amma təssüf ki, təsəllidən başqa gücüm heç nəyə çatmır.

***

"Xalama ömründə heç bir dənə gül almısanmı?" - zarafatla hər dəfə verdiyim o suala qəribə bir gülüşlə cavab verərdin.

Yaddaşımda səni həmin gülüşünlə saxlamışam...

Kim bilir? Bəlkə də dünyanın ən gözəl güllərindən bir dəstə bağlayıb həyat yoldaşına bağışlamağı da düşünmüsən son nəfəsində...

Gülləri sevirdinmi, ya yox, bilmirəm. İndi məzarın güllərə qərq olub, susqun adam...

Səninlə vidalaşmaq hamımız üçün ağır oldu. Yerin cənnət olsun!

***

*Adil Bəhlul oğlu Alıyev 02 mart 1952-ci ildə Laçın şəhərində anadan olub. 1974-cü ildə S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinin (indiki Bakı Dövlət Universiteti) fizika fakültəsini bitirib.*

*1974-cü ildən Laçın şəhər orta məktəbində müəllim kimi fəaliyyətə başlayıb. Laçın rayon Komsomol Təşkilatı pleniumunun üzvü və Rayon Komsomol Komitəsinin ştatdankənar katibi kimi ictimai vəzifədə çalışıb. Laçın rayon 127 nömrəli Texniki Peşə Məktəbində direktor müavini, Laçın rayon Partiya Komitəsində təlimatçı vəzifəsində işləyib. 1992-ci ildə Milli Orduda komandir müavini, 1993-cü ildə Laçın rayon 40 nömrəli orta məktəbdə müəllim olub. 2006-cı ildən Laçın Rayon Təhsil Şöbəsində məsləhətçi, 2007-ci ildən müdir müavini vəzifələrində çalışıb.*

*10 dekabr 2017-ci il tarixdə vəfat edib.*

*Qarabağ müharibəsi veteranı idi. Evli idi, 2 övladı, 4 nəvəsi var.*

**Qönçəgül KAMALQIZI**

**KİTAB RƏFİ**

## LAÇIN SEVGİSİ, LAÇIN YANĞISI




Sinəsində nəğmələrlə dolu olan bir ürək gəzdirir Aydın müəllim. İlk görüşümüzdən heyran olmuşam bu qocaman müəllimə, el ağsaqqalına. Yerişi, duruşu uca dağlarımızı xatırladır Aydın Qədimoğlunun. Götürdüyü soyad kimi özü də bütün cəhətləriynən qədim adamdı. Laçında doğulub, erkən gəncliyi də Laçın dağlarının ətəklərində, yaylaqlarında, buzlu bulaqlarının başında keçib. Gənc müəllim kimi əmək fəaliyyətinə Kəlbəcərdə başlayıb, ona görə sözünün o başı da Kəlbəcərdi, bu başı da. Doğma Laçınımız qədər yanıb tökülür Kəlbəcər itkisinə... "Sabahım Laçındı" kitabıynan neçə müddətdi həmsöhbətəm. Şeirlərində başı qarlı dağlarımızın, güllü yamaclarımızın, bulaqların laylasında uyuyan dərələrimizin əksi var. İlk şeirlərini Kəlbəcərdə yazıb qocaman şair, bəlkə, o səbəbdəndir ki, hər dəfə oxuyanda vaxtıynan qayğısıynan qızındığı, könül verdiyi Kəlbəcər ellərinin ətrini duyuram. Bir şeirində sevdiyinə üzünü tutaraq deyir:

*Həyatda hər şeyin əzizi sənin,*
*Bütün təamların ləzizi sənin,*
*Dünyanın ümmanı, dənizi sənin,*
*Ahımdan od tutan sal mənim olsun.*

Laçın, Kəlbəcər, Qarabağ kimi cənnətlərindən cüda düşmüş şairin bundan artıq təmənnası olmaz. Ömrün pir zirvəsindən üzüaşağı baxanda fani dünyanın astar üzü daha aydın görünür:

*Dünya dəllal bazarıdır,*
*Satana bax, alana bax.*
*Cənnət, cəhənnəm deyilən,*
*Uydurulmuş yalana bax.*

*Ömrümü çapıb talama,*
*Canımı oda qalama.*
*Həyat yolu sərt, dolama,*
*Yarı yolda qalana bax…*

və ya:

*Yanılır dünyaya fani deyənlər,*
*Yaranmış hər şeyin əzəli dünya.*
*Bir yanı zimistan, bir yanı bahar,*
*Beləcə gəşt eylər məzəli dünya.*

*Toy-düyünü, keyf-damağı var onun,*
*Yadda qalan dəmli çağı var onun.*
*Gəldi-gedər çox qonağı var onun,*
*Dərdə salıb neçə gözəli dünya…*

Dünyanın yaxasından tutub, vafasızlığından, kimsəyə sona qədər yar olmamasından bütün şairlər gileyləniblər, Aydın müəllimin şeirlərində dünyanın gözəl tərəfləri də necə var eləcə görünür. Şeirin əzəli mövzularına öz baxışı var qocaman şairin:

*Qovuşar, sağalar xəncər yarası,*
*Sağalmayan yara söz yarasıdır.*

Bəli, sözün yara sağaltmaq qüdrəti var, amma onu xəstəsinə vaxtında və düzgün çatdırmağı bacarmaq lazımdır:

*Təbi zorlasan da şeir yaranmaz,*
*İlhamın coşmasa qələm götürmə.*
*Qazanc da qudurub yeyər mayanı,*
*Yersiz borca getmə, sələm götürmə.*

*Günahkar olanda yu günahını,*
*Elə et ki, yusun su günahını.*
*Ağılla xırd elə söz mətahını,*
*Yad suçun boynuna, Lələ, götürmə.*

Dünyagörmüş qələm sahibindən gələn sanbalı öyüd-nəsihət...

Kitabı vərəqlədikcə, mövzu və formaca müxtəlif olan şeirlər misra-misra oxucunun sinəsini dağlayır, içini göynədir. Bu şeirlərin iliyi, qanı yurd həsrəti, qaçqınlığın, köçkünlüyün gətirdiyi ağrılarla, əzablarla doludur:

*Qəm möhnətli, qəm yüklüyəm,*
*Şələm elə ağırdı ki.*
*Yolum uzaq, vətən qürbət,*
*Cığır həmən cığırdı ki.*

*Yağılara qaldı dağlar,*
*Qüssədən saraldı dağlar.*
*Gözüm yaş tökər, qan ağlar,*
*Dünya tamam nağıldı ki.*

*Nə bağçama gül ələndi,*
*Üzümdə yaş giləlendi.*
*Aydın dərdlə silələndi,*
*Qəm içində boğuldu ki.*

Klassik aşıq şeiri formalarında ustalıqla gəzişən şair, oxucusunu yorulmağa qoymur:

*Tale kitabını gətir,*
*Höccələyək sətir-sətir.*
*Ömür yolu sona yetir,*
*Günlər yazıla-yazıla.*

*Sərtlik poladın xasında,*
*Mərdlik mərdin mayasında.*
*Aydın namərd dünyasında*
*Gəzir sozala-sozala...*

Dağlarda dünyaya göz açaraq at belində ömür sürmüş qələm sahibinin dağlara müraciət etməsi, qoşmalar, gəraylılar qoşması təsadüfi deyil:

*Üstündən gözəllər əskik olmasın,*
*Atlanıb qoynunda düşüm, a dağlar.*
*Əldə tüfəng çıxım kəklik ovuna,*
*İz ilə gədiklər aşım, a dağlar.*

*Hanı beçə balı, camış qaymağı,*
*Qırxbuğum kətəsi, nehrənin yağı?*
*Dağlar mehman etsin əziz qonağı,*
*Belə gəlib keçə yaşım, a dağlar...*

və ya:

*Yapıncı geyərdim sıx dumanından,*
*Dərdimin məlhəmi, əlacı dağlar.*
*Əlim ətəyindən vaxtsız üzüldü,*
*Yolum sizdən düşdü qıyqacı, dağlar.*

*Sənin nisgilinə dözüm qalmayıb,*
*Ocağım səngiyib, közüm qalmayıb.*
*Dünya nemətində gözüm qalmayıb,*
*İstər şirin ola, ya acı, dağlar.*

Bildiyimə görə, Aydın müəllimin və övladlarının hal-hazırda dolanışıq, ev-eşik sarıdan heç bir çətinliyi yoxdur, amma bunların heç biri doğma kəndində qoyub gəldiyi ocağı qədər isidə bilmir onun yurd həsrətli şair ürəyini. Haqqında danışdığım kitabın səhifələrini bəzəyən şeirləri oxuduqca Laçının, vaxtıynan müəllim işlədiyi Kəlbəcərin, Qarabağın dağlarının, əlçatmaz zirvələrinin, kəndlərinin, ovlaqlarının, dolaylarının, al-yaşıllı, çiçəkli yamaclarının xəritəsini görmək mümkündür:

*Yamanca kövrəlib yenə də qəlbim,*
*Bir ana laylası yadıma düşür.*
*Murovdağın, Dəlidağın, Qırxqızın*
*Zirvəsi, yaylası yadıma düşür.*

*Bağça-bağım, dörd bir yanım necoldu,*
*Ev-eşiyim, xanimanım necoldu?!*
*Sarıbabam – gündoğanım necoldu,*
*Göllərin sonası yadıma düşür.*

Kökdən-soydan, ləhcədən gələn bir şirinlik, doğmalıq var bu şeirlərdə. Səksəni geridə qoymuş şair-müəllim ömrünün yadigarıdır bu nisgilli şeirlər, nə yazıq ki, son 25 ilin qaçqın-köçkün damğaları, izləri, yanğıları var hər misrasında. Nədən yazır yazsın, Laçın dərdi, yurd yarası daha çox diqqət çəkir, qəlbi göynədir Aydın müəllimin şeirlərində:

*Laçınsız nə həyat, Laçın qanımdır,*
*Onsuz keçən günlər ah-fəğanımdır.*
*Gətirdiyim təkcə quru canımdır,*
*O dağlarda vuran ürəyim qalıb.*

*Mənim o dağlardan silinməz izim,*
*Vətən həsrətliyəm, heç gülməz üzüm.*
*Çalbayırım, Mıxtökənim, Qırxqızım,*
*Dəlidağım – arxam, köməyim qalıb...*

Bəli, qalanları saymaqla, sadalamaqla qurtaran deyil, Aydın Qədimoğlu. Nəsr, təhlil, tənqid yazmaqda o qədər səriştəm olmasa da, tanışlığımdan bu yana şəxsiyyətinə, ağsaqqallığına heyran olduğum müdrik insanın şeirlərinə biganə qala bilmədim. Bir də hər görüşümüzdə Kəlbəcərdən, orada gördüyünüz və əbədi bağlandığınız yurdlardan, insanlardan danışdığınız şirin xatirələr sizə, kitabınıza, övladlarınıza bağlayıb məni, Aydın əmi:

*Aydın, gəz vətənsiz, dolan sərsəri,*
*De, halal zəhmətin nəymiş səməri?*
*Həyat müvəqqəti, hər şey ötəri,*
*Kimə qalacaqmış dünyanın varı...?!*



Heş kimə heç nə qalmayacaq, qalacaq bir şey varsa, o da sözdür. Dağ adamları dözümlü olur deyirlər, bəlkə Laçında, Kəlbəcərdə bir də görüşmək qismətimiz oldu, yaşayaq, görək!...

Yeni kitabınızda yeni şeirlərinizi
oxumaq arzusuyla: **Əlövsət SALDAŞ**

**POEZİYA**



## AYDIN QƏDİMOĞLU

Aydın Qədim oğlu Abbasov 1935-ci ildə Laçın rayonunun Pircahan kəndində anadan olub. 1949-cu ildə Pircahan kənd 7 illik məktəbini əla qiymətlərlə bitirərək Laçın Şəhər Pedaqoji Məktəbinə daxil olub. 1953-cü ildə məktəbi bitirdikdən sonra Kəlbəcər rayonunda müəllim kimi fəaliyyətə başlayıb. 1975-ci ildə Azərbaycan Pedaqoji İnstitutunun tarix fakültəsini bitirib. Pircahan kəndində ixtisası üzrə işləyərək müxtəlif vəzifələrdə çalışıb. 1992-ci ildən sonra Bakı şəhərində fəaliyyət göstərən Laçın rayon 2 №-li tam orta məktəbində dərs deyib. 7 övlad atasıdır. 2 oğlu, 5 qızı var. 2010-cu ildə "Sabahım Laçındı" adlı şeirlər kitabı çap olunub. Ön sözü xalq şairi Nəriman Həsənzadənin yazdığı kitaba şairin müxtəlif illərdə qələmə aldığı şeirlər daxil edilib.

### LAÇINDA TAPŞIRIN TORPAĞA MƏNİ

Ölərsəm bu yerdə dəfn eyləməyin,
Laçında tapşırın torpağa məni.
Nə kəfən, nə molla deyil gərəyim,
Bükün gül-çiçəyə, yarpağa məni,
Laçında tapşırın torpağa məni.

Şehindən bal əmim, doyduqca doyum,
İtburnu gülünün ətrini duyum.
Gül-çiçək içində rahat uyuyum,
Nə tabuta bükün, nə ağa məni,
Laçında tapşırın torpağa məni.

Aparın yaylağa yaylanmaq üçün,
Dağları son dəfə dolanmaq üçün.
Zirvədən dünyaya boylanmaq üçün
Qaldırın bir anlıq o dağa məni,
Laçında tapşırın torpağa məni.

Kişiliyin, mənliyimin dalınca,
Toy-düyünun, şənliyimin dalınca,
İtirdiyim gəncliyimin dalınca
Göndərin dağlara sorağa məni,
Laçında tapşırın torpağa məni.

O dağlardan doymamışam mən hələ,
Deyilməmiş sözüm var bir gözələ.
İçəm buz bulaqdan mən gilə-gilə,
Təşnəyəm, yetirin bulağa məni,
Laçında tapşırın torpağa məni.

Keçin Xocalıdan, keçin Şuşadan,
Vurğunuyam bu torpağın binadan.
Yol versin aşmağa Ulu Yaradan,
Düşürün dincliyə bir bağa məni,
Laçında tapşırın torpağa məni.

Aydınam, arzumdan dönən deyiləm,
Elə məşələm ki, sönən deyiləm.
Yurdumu yağıynan bölən deyiləm,
Tanrı heç çəkməsin sınağa məni,
Laçında tapşırın torpağa məni.

## MƏNİM OLSUN

Seç götür, ay dilbər, könlün sevəni,
Yanaq sənin olsun, xal mənim olsun.
Mən olum ac arı, sən şəhdi-şəkər,
Qaymaq dodaq sənin, bal mənim olsun.

Cəllad gözlərinə eylə qadağa,
Qoy canım canına olsun sadağa.
Hər ikimiz bağban olaq bir bağa,
Dəymiş sənin olsun, kal mənim olsun.

Dünyanı dolaşaq başdan-ayağa,
Başımıza leysan ha yağa-yağa.
Yol gedək bir aydın, nurlu sabaha,
Sevinc sənin olsun, qəm mənim olsun.

Həyatda hər şeyin əzizi sənin,
Bütün təamlann ləzizi sənin.
Dünyanın ümmanı, dənizi sənin,
Ahımdan od tutan sal mənim olsun.

Aydın üzü haqda, dili soraqlı,
Gəzər payi-piyada, əli çıraqlı.
Bir şirin ləhcəli, bir xoş qılıqlı,
Sənin kimi əhli-hal mənim olsun.

## ÖZÜMƏ NƏSİHƏT

Özümdən özümə nəsihətdi bu,
Mərdi qova-qova namərd eyləmə.
Dünyanın qovğası sənəmi qalıb,
Yığıb ürəyinə çox dərd eyləmə!

Tanrı haqdan verib bu iki gözü,
Ki ayırd edəsən əyrini, düzü.
Qəmdən uzaq olsan yaşarsan yüzü,
İki əlin işin seç, dörd eyləmə!

Sən ki hal əhlisən, deyilsən uşaq,
Olma gəl sadəlövh, ürəyi yumşaq.
Dur mənimlə bu dünyanı dolaşaq,
Yetəni özünə həmdəm eyləmə!

Qadının öz yeri, ərin öz yeri,
“Maya”nın öz yeri, “nər”in öz yeri.
Tülkünün öz yeri, şirin öz yeri,
Çaqqalı ucaldıb boz qurd eyləmə!

Aydın, elə dost tut olsun uyarı,
Dostluqda pozmaynan əhdi, ilqarı.
Kəndin Pircahandan qeyri diyarı
Amandır özünə gəl yurd eyləmə!

## SÖZ

Söz ki var tarixlər yadigarıdır,
Dünyada əbədi qalasıdır söz.
Sevincdir, fərəhdir düşünsən dərin,
Həm də könüllərin naləsidir söz.

Söz ilə silinər könüllər pası,
Söz bir həzin nəğmə, ana laylası.
Söz ata-ananın xeyir-duası,
İnsan övladının balasıdır söz.

Göylərə ucalan amanlar, ahlar,
Sözün qüdrətinə baş əyib şahlar.
Sözlə əfv edilir suçlar, günahlar,
Qəlblərin aynası, qalasıdır söz.

Daş-qaşa beləcə gəl salma həvəs,
Sözdən qala ucalt, sözdən gey libas.
Dinlə, qafil olma, sözə qulaq as,
Ən müşkül dərdlərin çarəsidir söz.

Naşı gülləsitək dəyməz hədəfə,
Söz bənzər inciyə, dürrə, sədəfə.
Sözü deməmişdən düşün yüz dəfə,
Ağılsız başların bəlasıdır söz.

Kainat əbədi, qışı, baharı...
Ağlı olan pozmaz əhdi, ilqarı.
Aydın söz sərrafı, söz kamandarı,
Nədə ki, saralıb solasıdır söz.

**MUZEYLƏRİMİZ**

## ƏSİRLİKDƏ QALAN LAÇIN MUZEYİ

Azərbaycanda muzey işinin tarixindən danışarkən xüsusi qeyd olunmalıdır ki, bu sahəyə diqqət və qayğı ümummilli lider Heydər Əliyevin fəaliyyətində mühüm yer tutmuşdur. O, xalqımızın əsrlər boyu yaratdığı sərvətin – mədəni dəyərlərinin toplanılması, qorunması və daha da zənginləşdirilməsi üçün əməyini əsirgəməmişdir. 1970-ci illərdən başlayaraq respublikamızda müxtəlif profilli muzeylərin yaradılması, fəaliyyət göstərən muzeylərin zənginləşdirilməsi buna parlaq misaldır.

1979-cu ildə respublika hökuməti tarix və mədəniyyət abidələri ilə zəngin olan Laçın rayonunda Tarix-Diyarşünaslıq Muzeyi yaradılması barədə qərar qəbul etdi.

1980-ci ildə muzeyin yaradılması üçün toplama işinə başlandı. Həmin ildən muzeyə rəhbərlik mənə tapşırıldı. Laçın Tarix-Diyarşünaslıq Muzeyi fondunun zənginliyi, nadirliyi, ekspozisiyasının baxarlılığı ilə seçilirdi.

Muzeyin yerləşdiyi bina tarixilik baxımından qiymətli idi. Bu bina 1924-cü ildə Laçın şəhərinin salındığı dövrdə, Azərbaycan memarlığı üslubunda inşa edilmiş, fasadı rəngli şəbəkə üsulu ilə işlənmişdi. Muzeyin ekspozisiyasının sahəsi 360 kv.m., 9 zaldan ibarət idi. Bundan əlavə muzeyin həyətində 360 kv.m-lik sahədə də açıq səma altında ekspozisiya fəaliyyət göstərirdi. Burada Laçın rayonunun qədim daş plastikasını özündə əks etdirən sənət nümunələri nümayiş etdirilirdi. Muzeyin fondunda 5 minə qədər əşya mühafizə olunurdu.

1989-cu ildə rayonun Güləbird kəndində XVII əsrdə yaşamış bayatı ustadı Sarı Aşığın xatirə muzeyi istifadəyə verildi. Həmin xatirə muzeyinə muzeyimiz tərəfindən Sarı Aşıqla bağlı 150 əşya bağışlanmışdı.

Laçın rayonunun tarixi, etnoqrafiyası, arxeologiyasına aid materiallardan, həmçinin maddi və mənəvi mədəniyyət, sənətkarlıq nümunələrindən ibarət unikal əşyalar 1992-ci ilin may ayının 18-də Ermənistan Respublikasının torpaqlarımıza təcavüzü nəticəsində talan olundu, Ermənistana daşındı. Açıq səma altında fəaliyyət göstərən daş muzeyi sındırılaraq məhv edildi.

Hazırda ermənilər talan etdikləri muzey əşyalarını dünya ictimaiyyətinə erməni maddi-mədəniyyət nümunələri kimi təqdim edərək bir sıra ölkələrdə nümayiş etdirirlər.

Ermənilər ərazi iddiaları ilə yanaşı, indi də işğal etdikləri rayonlarda özbaşına qazıntılar aparır və qədim tariximizə aid tapıntıları öz adlarına çıxırlar. Onlar daha bir xəyanətə əl atmış, Laçın rayonunun Sonasar kəndi ərazisindəki qədim qəbiristanlıqda apardıqları dırnaqarası "kəşfiyyat" zamanı əldə etdikləri tapıntıları İrəvanda Ermənistan Tarix Muzeyinə vermişlər. Bu barədə internet saytlarında ermənilərin özləri tərəfindən məlumat

yayılmışdır. Bu əşyalar arasında qızıl, gümüş, bürüncdən hazırlanmış müxtəlif bəzək əşyaları vardır.

Mətbuatın yazdığına görə, həmin xəzinənin ümumi dəyəri 23,3 min ABŞ dolları dəyərində qiymətləndirilmişdir. Erməni xislətinə aid bir məsələni də qeyd etmək lazım gəlir. Belə ki, Ermənistanın rəsmi dairələri ilə Dağlıq Qarabağ separatçıları arasında bu dəfinə üstündə qalmaqal başlayıb. Tərəflərdən hər biri bu xəzinəyə sahib olmaq istəyir.

Qeyd olunmalıdır ki, hələ XIX əsrin sonlarında Laçın rayonu ərazisindən tapılmış bir sıra maddi-mədəniyyət nümunələri bu bölgənin qədim məskənlərdən biri olduğunu göstərmişdir. Burada tarixin müxtəlif mərhələlərini özündə əks etdirən zəngin abidələr aşkar edilmişdir. Onlar əsasən təbii mağaralardan, siklop tikililərdən, qədim yaşayış yerlərindən, təknə, küp, daş qutu, katakomba qəbirlərindən, qayaüstü təsvirlərdən, suvarma sistemlərindən, müdafiə qalalarından ibarətdir.

Bu abidələrdən tapılmış, e.ə. III minilliyə aid çoxlu gil qab qırıqları, dən daşları, dəvəgözü və çaxmaq daşlarından düzəldilmiş bıçaqlar və ox ucluqları qədim Tunc dövrünə, həmin dövrdə yaşamış əkinçi-maldar tayfaların iqtisadi və ictimai həyatına dair qiymətli tarixi mənbələrdir.

Hələ 1896-cı ildə Laçında tapılmış bir əşya – yuxarı hissəsində satirik teatr maskası təsvir edilmiş tunc lampa Peterburq Arxeoloji Komissiyasına aparılmışdır.

1924-cü ildə Laçın rayonunun Mirik kəndi ərazisində köhnə şəhər yeri açılmış və oradan 82 ədəd gümüş sikkə tapılmışdır. Bu sikkələrin 39 ədədi Səfəvi hökmdarları I Təhmasibin, 3 ədədi II İsmayılın hakimiyyəti dövründə, yəni hamısı XVI əsrdə zərb olunmuş, digər 39 ədəd gümüş alman talerinin də XVI əsrə aid olduğu elmi sübutlarla təsdiq edilmişdir.

Məlumdur ki, tarixin yazılmasında qəbir abidələri müstəsna əhəmiyyət kəsb edir.

1925-ci il avqust ayının axırlarında Laçın şəhərinin baş küçəsində kooperativ binasının özülü qoyularkən böyük daş plitədən düzəldilmiş, üstü də həmin ölçüdə digər plitə ilə örtülmüş qəbirlər çıxmışdır. Onlar bir-birinin üstündə üç cərgədən ibarət idi. Bu isə ərazidə uzun əsrlər boyu yaşayışın davam etməsini sübuta yetirir. Həmin qəbirlərin birinin yanında isə 5 ədəd əzilmiş qızıl sikkə tapılmışdır. Bu qızıl sikkələr Bizans imperatoru XIII Konstantin Dukenin (bəlkə də XII və ya XI Duke) imperator I İsaak Komnepin (1057-1059) oğlunun hakimiyyəti dövrünə aiddir.

1983-cü ildə isə Laçın rayonunun Əhmədli kəndində Azərbaycan Səfəvilər dövlətinə aid dəfinə tapılmışdır. Həmin dəfinənin içərisində I Sultan Süleyman və I Sultan Hüseynin hakimiyyəti dövründə Təbriz, Həmədan, Xoy, Naxçıvan, Gəncə və Şamaxıda zərb edilmiş gümüş pullar olmuşdur.

Laçın Tarix-Diyarşünaslıq Muzeyində saxlanılan bu dəfinə də (225 ədəd) ermənilər tərəfindən qarət edilmişdir.

Bunları deməkdə məqsədimiz Laçın rayonunun Azərbaycan xalqına məxsus maddi-mədəniyyət abidələri ilə zəngin bir bölgə olduğunu göstərməkdir. Və bu cür dəfinələrin tapılması təbiidir. Bu ərazi ən qədim yaşayış məskəni olmaqla, eyni zamanda burada mədəniyyət və iqtisadiyyat inkişaf etmiş, Azərbaycanın böyük şəhərləri və digər ölkələrlə sıx ticarət əlaqələri olmuşdur. Məlum həqiqətdir ki, həmin dövrdə bu yerlərə hələ erməni ayağı dəyməmişdi. Belə olan halda tapılmış maddi-mədəniyyət nümunələrini onların öz adlarına çıxması gülüncdür.

Bunları nəzərə alaraq belə hesab edirik ki, vaxtilə və hazırda Laçından və Azərbaycanın digər işğal olunmuş ərazilərindən Ermənistana aparılmış maddi-mədəniyyət nümunələri YUNESKO-nun mədəniyyət sərvətlərinin qaytarılması barədə Beynəlxalq Konvensiyalarının tələblərinə uyğun olaraq ölkəmizə qaytarılmalıdır.

Bir zamanlar respublikamızın ən zəngin muzeylərindən biri hesab olunan Laçın Rayon Tarix-Diyarşünaslıq Muzeyi 1992-ci ildən Bakı şəhərində N.Nərimanov rayonu Əliş Quliyev adına 2 saylı Texniki-peşə liseyinin 20 $m^2$ sahəsi olan bir otağına sığınaraq öz fəaliyyətini bərpa etmişdir.

Əsas fəaliyyəti toplama və yığım işindən ibarət olan muzey bununla kifayətlənməyərək bu illər ərzində toplanmış əşyaların hesabına çoxsaylı sərgilər təşkil etmiş, idarə, müəssisə, məktəblərlə sıx əlaqə yaratmış, ekskursiyalar keçirmiş, məruzə və mühazirələrlə ictimaiyyət qarşısında çıxış etmişdir. Muzeyin fəaliyyəti dəfələrlə Azərbaycan Dövlət Televiziyasında və mərkəzi mətbuatda işıqlandırılmış, işinə müsbət qiymət verilmişdir.

Muzeydə "Müstəqilliyimiz əbədidir", "Azərbaycan Xalq Cümhuriyyəti – 94", "Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin laçınlılarla görüşü", "Laçın foto yaddaşlarda", "Erməni vandalizmi" adlı sərgilər, Laçının işğalı gününə, Milli Qəhrəmanlarımıza və s. həsr edilmiş tədbirlər keçirilmiş, məktəblilərə ekskursiya xidməti göstərilmişdir.



Toplama işi ilə bağlı mətbuat və televiziyada əhaliyə müraciət edilmiş, rayonun tarixini, etnoqrafiyasını özündə əks etdirən materialların muzeyə təqdim olunması sahəsində təbliğat işi gücləndirilmişdir.

**Solmaz MƏHƏRRƏMOVA,**
***Əməkdar mədəniyyət işçisi,***
***tarix elmləri doktoru***

**POEZİYA**

**Xutra RAMAZAN,**
*avar şairi*



## UCA DAĞLAR, A DAĞLAR

Fəlakətlər dünyanı
Öz cənginə alanda;
Qasırğalar, tufanlar
Min müsibət salanda;
Bütöv-bütöv ölkələr
Sulara qərq olanda;
Ruzgarın acı hökmü
Bəşəri sarsıdanda
Sinəni sipər edib,
Qoynunu səngər edib
Hər bəladan, xətadan
Sən bizi qoruyursan,
Qoca dağlar, a dağlar.

Bəlkə bizi hifz edən
Allahın qüdrətidir,
Din-imana sarınan
Elin kəramətidir?
Alınmaz qalamısan,
Ulumusan, ya nədir?
Səndə də var bir hikmət,
Burda sözüm qətidir.
Heyranam bu hikmətə –
Səndəki əzəmətə.
Ətəyini öpərək
Sığınmışam balantək.
Eşqim, sözüm, ömrümsən,
And verirəm sənə mən,
Uca dağlar, a dağlar.

## XOCALI HARAYI

Bir haray yüksəlir illərdən bəri –
Ruhları sarsıdan, qəlb didən haray.
Bir haray titrədir yeri, göyləri –
Cahan ürəyini göynədən haray.

O, Xirosimadan, Xatından betər
Torpağın bağrını yarıb ucalır.
Bu haray mənimdir – eşitsin bəşər,
Soyadım Qarabağ, adım Xocalı.

Bu haray göynədir təzə yaratək,
Köçsə də tarixin qan yaddaşına.
Üzüdönük çıxdı o zalım fələk,
Xocalı, gör nələr gəldi başına!

O soyuq, o müdhiş, o mənfur gecə
Bəxtin yad əliylə qara yazıldı.
Yüz-yüz günahsızın adı gör necə
Al qanla ağappaq qara yazıldı?!

Arxalı, yaraqlı, saqqallı qullar
İnsanlıq haqqını tapdadı keçdi.
Şirin nağıllarla yatan noğullar
O gecə qorxulu nağıla düşdü.

İşlədi iliyə duyan insanın
Qar üstə sərilən qoca harayı.
Bayaqdan can vermiş cavan ananın
Döşündə süd gəzən uşaq harayı...

Yadlar tapdağında o dilbər guşə
Gül-çiçək yerinə qanqal bitirir.
Solan xarıbülbül, küsən bənövşə
Baharın gözünə həsrət gətirir.

Həqiqət dediyin budursa, onda
Əsl mətləbini anlatdın, dünya.
Natəvanı qərib etdin yurdunda,
Üzeyir ruhunu ağlatdın, dünya.

Qana susayanlar qan-qan deyəndə
Qanundan deyənlər susdu lal kimi.
Anaların ahı ərşə dəyəndə
BMT-yə çatdı adi hal kimi.

Xocalı harayı – doğma, müqəddəs,
Bizim qəlbimizdə adiləşməsin.
Neçə ki, həyat var, o ilahi səs
Ötəri duyğutək ötüb keçməsin.

Hayqır ki, ey cahan, çatsın harayı
Ali şuraların kar qulağına.
Gözəl Qarabağın öz haqqı-sayı
Ədalət naminə qayıtsın ona.

## SƏN GİROVSAN, DÜNYA

Dünya! Bizə borcun çoxdur,
Qaytarmaqla yoxdur aran.
İllər ilə əlbir olub
Nəyimiz var aparırsan:
Uşaqlığın sevincini,
Gəncliyimi, dincliyimi
Aldın getdin – qaytarmadın;
Qollarımın qüvvətini,
Dizlərimin taqətini
Aldın getdin – qaytarmadın;
Saçlarımın qarasını,
Gözlərimin mayasını
Aldın getdin – qaytarmadın;
İlk eşqimi, son sevgimi
Hər şeyimi, hər şeyimi...
Aldın getdin – qaytarmadın.
Ta nə qaldı bu ömürdən? –
Quru nəfəs, quru bir can.
Bilirəm ki, gözün doymaz,
Sən ona da göz qoyubsan.
Dünya, söylə istəyin nə?
Mənan nədir?
De, nəymişsən? –
Ayranı turş nehrəymişsən.
Silkənərsən, çalxanarsan,
Dolduğuntək boşalarsan.
Nə yağından yeyən doyub,
Nə ayranın içən olub.
Hər ilinə, hər gününə,
Saatına, saniyənə
Xırdalayıb satdığını
Qaytarası olsan əgər,
Müflis olub dağılarsan,
Yox olarsan, qoca dünya!
Sənin bizə borcun çoxdur,
Sən girovsan borca, dünya!

***Təqdim etdi:*** **Elnur İRƏVANLI**

**POEZİYA**

Vəzirxan SÜLEYMANOV



## VAR MƏNİM

Taledən heç bir şey istəmirəm mən,
Dürüst ağlım, xoş xəyalım var mənim.
Gözüm yoxdur bu dünyanın malında,
Bir mənəvi xanimanım var mənim.

Hələ cəmdir, çaşmayıbdır xəyalım,
Qarabağım təməl daşım, amalım.
İrəvanım, Zəngəzurum, Borçalım,
Dərbənd kimi bir mahalım var mənim.

Azad bayrağımız hər bir diyarda,
Dalğalanır Amerikada, Londonda.
İlin dörd fəsli bahardır burda,
Kim deyər ki, zimistanım var mənim?

Bir kimsəyə olmayıbdır minnətim,
Haqdan gəlir, var dadıma yetənim.
Şükür Allah, azad yurdum, Vətənim,
Belə gözəl bir zamanım var mənim.

Qulalı, Əyriqar, Arxud bulağım,
Əriməz Çalbayır, Qırxqız yaylağım.
Kəlbəcərim, Cəbrayılım, Qubadlım,
Laçın kimi Gülüstanım var mənim.

Şair qəlbi gizli sirdir, bilinməz,
Haqdan gələn nurdu gözə görünməz.
Vəzirxanam, sinəm dolu tükənməz,
Yazılmamış min dastanım var mənim,
Yazılmamış min dastanım var mənim.

## İLLƏR MƏNİM XATİRİMDƏ QALIBDIR

***(Gənclik illərindən xatirə)***

Yaş yüz olsa, unutmaram ölüncə,
İllər mənim xatirimdə qalıbdır.
Lalə, nərgiz, tər bənövşə yığdığım,
Güllər mənim xatirimdə qalıbdır.

Kim unudar ötən ilin ayların?
Yaşıl çəmənlərin, göy yaylaqların,
Çox görmüşəm coşub-daşan çayların,
Sellər mənim xatirimdə qalıbdır.

Həsrət-həsrət çox baxmışam uzaqdan,
Dolanmışam kənar – kəsmə qıraqdan.
İlk məktubu uzatdığı uzaqdan,
Əllər mənim xatirimdə qalıbdır.

Adına bağ salıb, bostan əkdiyim,
Həsrətindən göz yaşları tökdüyüm.
Əllərimlə bir vaxt sığal çəkdiyim,
Tellər mənim xatirimdə qalıbdır.

Yaşıl yaylaq, kəklikləri xınalı,
Cüyür nə gözəldir yanı balalı.
Üstü dolu, yaşılbaşlı sonalı,
Göllər mənim xatirimdə qalıbdır.

Gör yenə yadıma düşdü haralar,
Sağalmaz aldığım ağır yaralar.
Gəzib-dolandığım sonsuz səhralar,
Çöllər mənim xatirimdə qalıbdır.

Sədalıyam, cənnət yurdum Səfalı,
Oğlanları igid, qızlar həyalı.
Bir-birinə doğma, əziz, vəfalı,
Ellər mənim xatirimdə qalıbdır.

## ƏDƏBİ DÜŞÜNCƏLƏR

## Vəliş QARAGÖL: *"DÜNYANIN ŞƏLƏSİN QOY ÖZÜM ÇƏKİM"*

Əziz oxucular, bu yazımda da sizə haqqı əlində bayraq edən, qəlbində Laçın dağlarından aldığı saflığı, əzəməti, vüqarı bəsləyən, Vətənin dərdini özünün ağır şələsi hesab edən, sevincin və kədərin hərəsin öz yerində yazan və ilaxır və ilaxır bir insandan, bir "köhnə kişidən" (Nizaməddin Şəmsizadə, tənqidçi, filologiya elmləri doktoru, professor) – Vəliş Qaragöldən söz açacağam.



Nağıyev Vəliş Əliş oğlu 1950-ci ildə Laçın rayonunun Sadınlar kəndində kolxozçu Əliş kişinin ailəsində dünyaya göz açmışdır. Atası Əliş kişi digər kənd sakinləri kimi kolxozda çalışır, alın təri ilə, zəhməti ilə qazandığı halal çörəklə beş övladını (iki oğlu, üç qızı) böyüdürdü. Yeddi yaşında Sadınlar kənd yeddiillik məktəbinin I sinfinə gedən Vəliş sonrakı təhsilini Qarıqışlaq kənd tam orta məktəbində davam etdirmişdir. Vəliş hələ kiçik yaşlarından ədəbiyyata maraq göstərmişdir. Onda ədəbiyyata olan marağı o zamanlar Sadınlar kənd səkkizillik məktəbinin Ana dili və ədəbiyyat müəllimi Şahlar Babayev yaratmışdı. Vəliş yazıçı və şairlərimizin kəndin kitabxanasında olan kitablarını demək olar ki, tamamilə mütaliə etmişdi. Kiçik yaşlarından yazdığı şeirlər "Laçın" qəzetində dərc olunurdu. Həyatımızın müxtəlif sahələrinə aid yazılarla mətbuatda çıxış edən Vəliş 1970-ci ildə sənədlərini Bakı Energetika Texnikumuna verir. Texnikuma daxil olduqdan sonra da mətbuatda müxtəlif məzmunlu yazılarla çıxış edir. Vəliş Laçının, onun təbiətinin vurğunudur. Doğma elinə, obasına bağlı olan Vəliş ötən əsrin 80-ci illərində ailəsi ilə birlikdə Bakıya köçür. Vəliş hazırda Azərbaycan Yazıçılar Birliyinin və Azərbaycan Jurnalistlər Birliyinin üzvüdür. Bakı şəhərində yaşayır. Üç övladı, 11 nəvəsi var.

***

Xəyanətkar qonşularımızın Laçın rayonunu işğal etməsi Vəlişi də elinə, obasına, yurd-yuvasına möhkəm bağlı olan bir türk oğlu kimi bərk hiddətləndirir. O, ermənilərin iç üzünü ifşa edən "Bu yol Laçına gedir" adlı bədii-publisistik əsərini yazır. Əsərdə ermənilərin elə erməni müəlliflərinin öz sözləri ilə iç üzü ifşa olunur. Əsərdə ermənilərin torpaq hərisliyi, türk

oğullarının qarşısında necə diz çöküb yalvarmalarından, erməni xəyanətkarlığına nifrətdən, sadə kənd adamlarının müdrikliyindən geniş söhbət açılır.

Onun əsər və məqalələrinin çap olunduğu qəzet və jurnalların coğrafiyası çox böyükdür. “Abşeron” qəzeti, “525-ci qəzet”, “Yeni Azərbaycan” qəzeti, “Ədalət” qəzeti, “Səhifələr” qəzeti, “Ulduz” jurnalı, “Azərbaycan” jurnalı və s.

Azərbaycan Jurnalistlər Birliyinin üzvü Vəliş Qaragölün Qarabağ mövzusunda yazdığı “Bir cüt hörük” adlı kiçik həcmli əsəri Azərbaycan Yazıçılar Birliyinin “Yaddaş” milli mükafatına layiq görülmüşdür. Əsərdə Qarabağ savaşında əsir düşmüş oğlan və qızlarımızın ümumiləşmiş obrazı özünəməxsus şəkildə canlandırılmışdır.

Əsərdə bir türk oğlunun qeyrətindən bəhs edilir, onun əsir düşmüş türk qızının namusunu necə qoruduğu təsvir olunur. Soydaşlarımızın qanına susayan erməni cəlladlarının çirkin əməlləri və niyyətləri böyük ustalıqla və peşəkarlıqla oxucuya çatdırılır.

“Tərəkəmə qızı” hekayələr toplusu da (ön sözü tənqidçi, filologiya elmləri doktoru, professor Nizaməddin Şəmsizadə yazmışdır) Vəliş Qaragölün Qarabağ mövzusuna həsr olunmuş əsərləri silsiləsindəndir. Kitabda “Dilənçi payı”, “Borc”, “Yerevan həbsxanasında qətl”, “Ana südü şaxtada donmur”, “Tərəkəmə qızı”, “Bir qış gecəsinin ilğımları” kimi hekayələri, bir çox publisistik yazıları oxucunu Vəlişin dərdlərinin doğulduğu məkana – Qarabağa aparır, yəni əsl kişilərin qeyrət, igidlik, mərdlik dünyasına...

“Tərəkəmə qızı”ndakı Əfsanə əslində Həcərin davamçısıdır, dövrümüzdə yaşayan Həcərdir. Yazıçı demək istəyir ki, türk dünyası həcərlərin qeyrət, namus, sədaqət, ismət və məğrurluq dünyasıdır. Bu dünyada həcərlər, əfsanələr at belində doğulur, anası onları at belində mayalandırır. Qeyrət, namus, mərdlik onların kökündən gələn və damarlarında axan qanındadır.

Onun Əfsanəsi Qarabağda döyüşən, igidlikləri əfsanəyə çevrilmiş qəhrəman qızlarımızın ümumiləşdirilmiş obrazıdır.

Bu kitabında “Üzü dağlara, dağlara”, “Azad yaşamaq eşqi”, “Girov obaların payız naxışları”, “Yaralı torpağın ağrıları”, “Dərdin Qarabağ ağrıları” və s. kimi xeyli publisistik yazıları da toplanmışdır.

Uzun illərdir “Həkəri lal axmır” adlı tarixi roman üzərində işləyir.

Vəliş “Səni sevdim ki...” (fəlsəfi düşüncələr) adlı kitabını çapa verib. Hazırda “Cütü çəkən, taysız kələm” adlı şeirlər kitabı üzərində işləyir. Yaradıcılığına Azərbaycanın Əli Vəliyev, Salam Qədirzadə, İsmayıl Şıxlı, Ağa Laçınlı, Şahmar Əkbərzadə və digər görkəmli yazıçı və şairlərinin xeyir-duası ilə başlayan Vəliş publisist və nəsr əsərləri ilə yanaşı, nəzm əsərləri də yaradır. Onun poetik dünyası büllur kimi saf, təmiz, halal, haram

tikə tanımayan, alın təri ilə qazandığı çörəyin qədir-qiymətini bilən müdrik insanların dünyasıdır. Onun dünyasında riyakarlığa, alçaqlığa, namərdliyə, rəzilliyə, yaltaqlığa yer yoxdur, onun dünyası müdrik kişilərin, çörəyi daşdan çıxaran, lakin haram tikə yeməyən, sözü üzə deyən, haqqı nahaqın ayağına verməyənlərin dünyasıdır:

Vəliş, sözü düzünə de,
Özgəyə yox, özünə de.
Şah da olsa üzünə de,
Qılınc səni bölsə belə.

Torpağa, elə, xalqa bağlılıq, vətən sevgisi, yurd həsrəti onun şeirlərinin əsas qayəsini təşkil edir. Vətəndən ayrı düşmüş şair Qarabağ dərdini, Laçın dərdini dünyamızın ağır şələsi hesab edir:

Sənə yalvarıram, Tanrım,
mən çəkəni
kimsənin alnına yazma.
Dəvəsi ölmüş ərəbəm,
qoy çəkdiyimi çəkim.
Çəkdiyim dünya boydadı,
Elə dünyanın şələsini özüm çəkim.



İstedadlı yazıçının bütün yaradıcılığı doğulub boya-başa çatdığı dağlarla bağlıdır.

**Zakir ORUC**

**POEZİYA**

**Vəliş QARAGÖL**

## GƏLMİŞƏM

Qucağını aç balana, a dağlar,
Dumanına bürünməyə gəlmişəm.
Yüz çiçəkdən bal əmdiyim çölləri
Dizin-dizin sürünməyə gəlmişəm.

Mıxtökənin, Çalbayırın yamacı,
Hər kişiyə öz torpağı, öz tacı.
Yüz dərdim var, təkcə sənsən əlacı,
Ərk eləyib barınmağa gəlmişəm.

Bir hikmətdi ululların kəlamı,
Vətən varsa, qurban verrəm balamı.
Unutmaram haqqı-sayı, salamı,
El-obada görünməyə gəlmişəm.

Vəliş deyir, tor gəlibdi gözümə,
Köçdüyüm gün agah olub özümə.
Son mənzildə kəfən tutub üzümə,
Torpağına sarınmağa gəlmişəm.

## DÜNYADA

Halallıq başıma tac olan yerdə,
Niyə tamah salım vara dünyada?
Nifrəti içimdə dəfn eləmişəm,
Alsam da namərddən yara dünyada.

Dözdüm, öz baxtımın nazına dözdüm,
Şaxtalı qışına, yazına dözdüm.
Mənə çatan payın azına dözdüm,
Düşsəm də çətinə, dara dünyada.

Ocaq yerindədi, köz yerindədi,
Ovxar yerindədi, söz yerindədi.
Vəlişi axtarma, öz yerindədi,
İnanma əyilə sara dünyada

## OLAR, OLAR

Divan qabağında hesab sorulsa,
Yoxsulun günahı yüz olar, olar.
Dünyanın kəbini vara kəsilib,
Əyri əməllər də düz olar, olar.

Namərdə şərəfdi böhtan da, şər də,
Namərdlər gülməsin yıxılan mərdə.
Qanunlar tərsinə yozulan yerdə
Çör-çöpü yandıran köz olar, olar.

İgidi namusu, arı qoruyar,
Bar verən ağacı barı qoruyar.
Varlının adını varı qoruyar,
Yetimin kəlməsi söz olar, olar.

Vəliş, çöp uzatma şər yuvasına,
Bu dünya oynayır var havasına.
Çəkmə haqlıları haqq davasına,
Axırda tökülən göz olar, olar.

## QARA SÜKUT

O gün zaman dayandı,
O gün Həkəri çağlamadı.
O gün göy kişnəmədi,
bulud ağlamadı.
O gün adamı içindən yeyən
qara,
qapqara bir sükut vardı,
Torpaq
o sükutun qucağında
və Allahın gözü qabağında
qan doğurdu.
O gün Laçın
İmam Hüseynin
yaralı bədəni kimiydi.

**OVQAT**

**Rəna MƏDƏTQIZI**



*İbrahimova Rəna Mədət qızı Laçın rayonunun Alıqulu kəndində doğulub. Hal-hazırda Rusiya Federasiyasının Yekaterinburq şəhərində yaşayır. Yeniyetməlik dövrünə düşən qanlı-qadalı illərdə şahidi olduğu hadisələri ürək ağrısı ilə qələmə alıb. Gənc nəslin yaddaşını korşalmağa qoymamaq baxımından faydalı olacağını nəzərə alıb nisgil dolu bu xatirələri "Laçın yurdu"nun oxucularına təqdim edirik.*

## YADDAŞ QANADLI SƏYAHƏT

1992-ci ilin may ayının əvvəlləri idi. Yaz gəlmiş, öz gözəlliyi ilə, rəngarəngliyi ilə insanı qarşısında heyran qoymuşdu. Elə bir rəng çaları yox idi ki, göz oxşayıb könül açmasın. Gül bülbülü, bülbül gülü çağırırdı. El arasında deyilən kimi "İlin-günün gözəl çağı idi". Uzun qış günlərindən sonra əzablı, əziyyətli məşəqqətləri geridə qalmış hər kəs yeni güc, həvəs, enerji ilə təsərrüfat işlərinə başlamışdı. Sanki ağır yükdən qurtulub yeni həyata başlanmışdı. Həyətlərdə bənövşələr, nərgizlər açmış, ətirləri ətrafa yayılaraq adamı bihuş edirdi. Evlərin açıq qapı-pəncərələrindən güllərin, çiçəklərin ətri süzülüb hər kəsi çölə çıxmağa məcbur edirdi. Sanki bu gözəlliyi ciyərlərinə çəkərək uzun müddət gül qoxusu ilə nəfəs almağa, yazın təsirini itirməməyə çalışırdılar. Təbiət öz əli ilə yaşıl xalısını ilmə-ilmə çalaraq bütün rəng çalarlarını parlaqlığı, gözəlliyi, təkrar edilməzliyi ilə toxumuşdu. Bu xalının üzərində gəzərkən utanaraq boynunu bükən bənövşələri əzməkdən, ayaqlamaqdan ehtiyat edərək gəzməyə çalışılardı. Gecələr ulduzlar o qədər yaxın olurdu, səhərlər düşmüş şehin üzərində günəşin şəfəqləri ulduzları yerə köçürmüş kimi görünərdi.

Kənd yenə adi günlərindən birini yaşayırdı. Çox güman ki, bazar günü idi. Ona görə ki, məktəbdə deyil, evdə idim. O zaman 16 yaşım vardı. Öz kənd məktəbimiz natamam orta məktəbi olduğundan qonşu kəndə 2 il gedib-gəlməli olurduq – Alıquludan Pircahana. Yağışa, yağmura, qızmar günə, qara, çovğuna, borana baxmayaraq. Belə olmuş, belə də davam etməkdə idi. Heç kim şikayətlənməz, gileylənməzdi. Belə qəbul olunmuşdu. Təhsil almaq üçün heç bir şəraitsizlik əngəl deyildi. Hər il ali məktəblərə qəbul olanların sayı da az olmazdı. Əzab-əziyyət öz bəhrəsini verirdi.

Son günlər narahatlıq artmaqda, hiss edilməkdə idi. Qonşu kəndə

çataçatda yüksəklik vardı. Sarı yoxuş adlandırılırdı. Buraya çatanda Sarıbaba dağının o üzündən gurultu səsləri gəlirdi. Bu səslər dağlarda əks-səda verərək sanki dağları yerindən oynadacaqdı. Bu Şuşadan gələn "qradların" səsi idi. Bu səslərdən, müharibə anlayışının heç də uzaqda olmayıb dağlardan aşıb bizə qədər gəlib çatan topların şaqqıltısından gülüşümüzü üzümüzdə qoyan, bizi qorxuya salan gurultudan təsirlənərək "Azərbaycan pioneri" qəzetinə məqalə yazmışdım. Çox güman ki, gedib ünvana yetişməmişdi. Hər gün yol gedib-gəldiyimiz uşaqların sayı da azalmışdı. Fevral ayında Xocalıda törədilmiş dəhşətli hadisələrdən sonra çox ailələr qız-gəlinləri, körpələri rayondan çıxartmışdılar. Sinif yoldaşlarımdan geri qayıdanlar da vardı, qayıtmayıb artıq getdikləri rayon və şəhərlərin məktəblərində oxuyanlar da. Hər gün az qala hər dərsdə vəziyyətlə bağlı müzakirələr aparılırdı. Geri qayıtmayan sinif yoldaşlarımızı çox zaman qınayırdıq. "Qaçıb getdilər. Qorxdular. Geri qayıtmadılar. Torpağı sevmək budurmu?" və s. ittihamlarla onları o ki, var tənqid edirdik. Müəllimlərimizin bir qisminin övladlarından gedənlər vardı. Biz onların da bostanına daş atırdıq, iynələyirdik. Bu bizə daha böyük həzz verirdi. Axı daha çox Vətən, torpaq sevgisini, onu qoruyub, uğrunda can verməyi onlar öyrədirdilər bizə. Bu qınaqlar qarşısında onlar susar, cavabsız qoyardılar ittihamlarımızı. Nəfəsimiz isti yerdən çıxırdı. Taleyin bizə hansı tələni qurduğundan xəbərsiz idik. Bir dəfə yolda söhbət düşəndə mən qızlara – "Əgər ermənilər bizim kəndə qədər gəlib çıxsalar mən istəyirəm anamın qucağında, dizləri üstündə məni güllələsinlər" – deyib qəhərdən boğularaq fikrimi tamamlaya bilməmişdim. Xocalı hadisələri ürəklərimizdə xal yaratmışdı. Valideynlərimiz çox söhbətləri gizlində danışırdılar. Ancaq yenə dəhşət saçan, qan donduran olaylar sızıb bizə də çatırdı. Dilə gətirilməsi belə mümkün olmayan, insanlığa sığmayan olaylar. Bu hadisədə bizim kəndimizdə yaşayan bir qadının ailə üzvləri – ata-anası, gəlinləri itkin düşmüşdü. Sinif yoldaşımın qardaşı isə 26 fevral gecəsinin şahidlərindən idi, milisdə (polisdə) işləyirdi. Neçə insanın xilaskarı olmuşdu. Gecədən səhərə qədər yaralı insanları, cəsədləri çiynində daşımışdı. Bu baxımdan hər gün müzakirələrimiz davam edirdi. Ətrafda nə baş verdiyindən öz yaş səviyyəmizdə hali idik.

Sakit, adi günlərdən biri idi. Səhər açılmışdı. Artıq səhər yeməyini yeyib yığışdırmışdıq. Bacım şəhərdən – Laçından bizə qonaq gəlmişdi. Payızda ailə qurmuşdu. Ailə qurana qədər Bakıda təhsil ala-ala işləyir, orada yaşayırdı. Havasını, suyunu dəyişmək üçün atamgil icazə alıb onu kəndə gətirtmişdilər. Yaz vaxtı kənddə sonuncu dəfə nə vaxt olduğunu bəlkə də unutmuşdu. Həmişə yayda məzuniyyətə gəlirdi. Bu səbəbdən süd-qatıq, qaymaq-çiyənin ən təzəsini süfrəyə düzən kim, ətək-ətək pencər yığıb kətə,

körpə quzu əti bişirən kim. Əldən-ayaqdan getmişdik. Axı həm də əziz qonağımız övlad gözləyirdi. Hətta qonşular da hərə öz payını gətirirdilər. Adət idi. Şəhərdən kimin qonağı gələrdisə, qonşular onun payını ayrıca gətirərdilər. Hava günəşli idi. Tək-tək buludlar ağ örtük kimi hərdən göyün üzünə gələrək ağır zəhmət sahibi olan kəndliləri günəşin yandırıcı şüalarından qorumağa çalışır, onların qayğısına qalırdı. Dərələrdən axan sular həzin səsləri ilə ahəng yaratmışdı. Bu ahəngə quşların cikkiltili nəğmələri də əlavə olunurdu. Bu həzin təbiət səslərinə o qədər alışmışdıq ki, onlarsız çox darıxdırıcı olardı. Artıq neçə il idi ki, anamın xəbərdarlığından sonra həyətimizdəki gilas ağaclarına qonan bülbülün öz nəğməsini oxuduğunun şahidi olmuşduq. Sözün əsl mənasında bu vaxtlar hər tərəf cənnətə dönürdü.

Əmilərimlə qonşu idik. Birdən əmimin yoldaşı qənşərimizdə olan, ağacların seyrək, həyətimizin görünən yerinə çıxıb üzü bizə tərəf dayandı.

Başından yaylığı çıxarıb əlinə aldı, hər iki əlini uzadaraq həyəcan dolu səslə qışqırdı, “Nə yatmısız qəflət yuxusunda? Şuşa dağılır, xəbəriniz var? Laçını (şəhəri) atəşə tutublar. Ayağı yer tutan qaçır. Qız-gəlin qalmayıb. Hamısını çıxardırlar. Siz də xalxın gəlinin gətirib əsir saxlamısınız burda. Nəyə saxlamısız axı? Göndərin getsin” – deyə dəhşət saçdı. Hər zaman yalnız kitablarda oxuyub, kinolarda baxdığımız “müharibə” sözü qara bulud kimi başımızın üstünü aldı. Donub qalmışdıq. Kim nə edəcəyini bilmirdi. Anam ehtiyatla rəngi qaçıb dodaqlarında qan qalmayan bacıma baxdı. Susduq. Susqunluğu telefon zəngi pozdu. Anam evə qaçdı. Zəng edən şəhərdən bibim oğlu idi. Danışanda heç zaman təmkinini pozmayan bu insan indi telefonda əsəbi halda çığırırdı: “Qızları niyə saxlamısız orda? Xocalının davamını istəyirsiz? Camaat çıxa bilmir evindən, gəlinini gözləyir. Quşun qanadında da olsa göndərin gəlsinlər!”

Anam ayaq üstə titrəyirdi. Atama tərəf çevrilib – “Əşi, çıx kəndi axtar, gör nə edirsən? Bəlkə bir gedən oldu. Xalx gəlinini gözləyir. Göndərək getsin!” – dedi.

Hər gün bizim kənddən rayona avtobus gedirdi. Bazar günündən başqa. Artıq avtobus vaxtı deyildi. Kənddə öz şəxsi avtomobili olan çox az adam vardı. Yenə də atam ümidini üzmədən kəndin ortasına çıxdı. Bacımla hazırlıq görməyə, yığışmağa başladıq. Aradan xeyli keçmiş atam gəlib bizə yola çıxacağımızı dedi. Anamla, qardaşlarımla necə sağollaşmağımız heç yadımda deyil. Yola çıxdıq. “Vilis” markalı maşın bizi gözləyirdi. Bu kəndin kolxoz sədrinin maşını idi. Atam bizi bərk-bərk tapşırıb əmimgildə düşürməyi tövsiyə etdi, “Allah amanında” – deyib yola saldı.

Artıq günortadan keçmişdi. Yol boyu cığırları, izləri, yolları, ağacları arxada qoyur, sanki onları acgözlüklə yaddaşıma yazmağa çalışırdım. Nəsə

bir təəssüf hissi vardı daxilimdə. Bu hissin cavabını illər sonra tapdım. Sən demə, bu ayrılıq uzun, sonu bitib-tükənməyəcək ayrılıq olacaqmış. Beləcə bacımla bir-birimizə qısılaraq cınqırımızı belə çıxarmadan yolumuza davam edirdik. Sürücü tək deyildi yanında kimsə də vardı. Kimliyini unutmuşam. Onlar söhbətlərində, biz isə susmağımızda idik. Biz şəhərə çatanda axşam düşürdü. Sürücü bizi lazım olan məkanda düşürüb əmimə salam çatdırmağımızı xahiş elədi. Minnətdarlıq edib getdik. Həyətdə heç kim yox idi. Sakitlik hökm sürürdü. Evə qalxdıq. Səliqəli, sahmanlı evdən əsər-əlamət qalmamışdı. Hər şey evin ortasına tökülmüşdü.

Gecə yağış başladı. Həm də atışma. Laçın şəhəri ermənilərin yaşadığı Dığ kəndi ilə üzbəüz idi. Bacımın yoldaşı döyüşürdü. Gecə evə gəldi. Dığdan atılan "Qrad"lar gecənin qaranlığında işıq saçaraq üstümüzə gəlirdi. Elə uzaqdan işartı görünən kimi qaçıb hamama girirdik. Bu artıq döyüş təcrübəsi olan bir insanın əmri idi. Rayonda hamam evin birinci mərtəbəsində tikilirdi. Dörd tərəfdən möhkəm beton özülü olurdu. Elə bu baxımdan da ən təhlükəsiz yer kimi hamam seçilmişdi. Hər ehtimala qarşı gecələmək üçün burada palaz, yorğan-döşək də vardı. Beləcə, ara səngiyən kimi evə qalxır, "Qrad" atılanda hamama qaçırdıq.

Yağış güclənirdi. Biz evə zəng edib çatmağımızı xəbər etdik. Son dəfə gecə danışdıq. İşıqlar sönmüşdü. Danışanda kənddə də güclü yağış, sel olduğunu dedilər. Səhərisi gün telefon əlaqəsi kəsildiyindən evimizlə danışa bilmədik. Yola çıxmağa hazırlaşırdıq, ancaq haraya gedəcəyimiz məlum deyildi. Günortaya yaxın yola çıxdıq. Bizi həyətdə "Kamaz" gözləyirdi. Üstü yarıdan bir qədər yuxarı ev əşyaları, yorğan-döşəklə dolu idi. Bu bir neçə ailənin ev əşyaları idi. Bibim – əmimin yoldaşı da az miqdarda ev əşyalarından yığdı ki, heç olmasa kiminsə evində gecələyəndə istifadə edə bilək. Bu, böyük bir dəryadan bir damla götürməyə bənzəyirdi. Bütün həyatı boyu qazandıqlarını bir anın içində qoyub getmək çox ağır idi.

Şəhərin mərkəzinə doğru irəlilədikcə vəziyyətin necə acınacaqlı olduğunun şahidi olurdun. Şəhər çox səsli-küylü olduğundan maşınların, tankların, zirehlilərin qulaq batırıcı səslərindən heç nə eşidilmirdi. Avtobuslar, yük maşınları, şəxsi maşınlar insanla, yüklə dolu idi. Körpələr ana qucağında, kimisi isə anaların kürəyində, yanlarında, əllərindən tutaraq dartır, ağlayır, qadınların hərdən qışqırtı səsləri eşidilirdi. Bütün maşınlar yoxlanılırdı. Əsgər yaşlı, döyüş qabiliyyəti olan kişilər, gənclər cəbhəyə göndərilmək üçün düşürülürdü. Qadınların qışqırıq səsləri də çox güman ki, bu səbəbdən idi. Bizim karvanımız isə yavaş-yavaş şəhərdən çıxırdı. Kabinədə əmim, bibim, bacım və mən oturmuşduq. Yer darısqal olduğuna görə bacım mənim qucağımda oturdu. Hiss edirdim ki, mənə görə narahatdı. Mən də ona nara-

hat olmağımı hiss etdirmirdim. Cansız, arıq qız idim. Bacımsa hamilə. Yolumuz isə saatlarla davam edəcəkdi. Artıq mən ayaqlarımı hiss etmirdim. Ağırlıq sümüklərimə qədər keçmişdi, amma susurdum. Axı necə şikayət edəydim? Neçə saat, neçə kilometr getdiyimizi bilmirdim. Ağcabədi yataqlarından birinə çatanda bizdən başqa da qonaqlar vardı. Gecəni qalıb səhəri yolu davam etdik. Yolumuz Bakıya – əzabların, əziyyətlərin ünvansız sahibliyinə doğru irəliləyirdi.

Bir həftədən artıq keçdikdən sonra anamla kiçik qardaşıma qovuşdum. Atamla böyük qardaşımsa ayrı-ayrı vaxtlarda Laçını tərk edəcəkdilər. Onlardan hələ də səs-soraq yox idi. Bu ayrılığa isə aylardan sonra son qoyuldu. Qəribə, anlaşılmaz hal baş verdi. Biz hamımız dayımın evinə yığışmışdıq. Nənəmlə kiçik xalam və böyük xalamın 10-11 aylıq körpə qızı da burada idi. Nə qədər Şuşanın, Laçının alınıb erməni əsarətinə düşdüyünü desələr də, heç kim inanmırdı. “Ola bilməz, mümkün deyil” – deyirdik. Axı biz bir neçə günlüyə, ara sakitləşənə qədər gəlmişdik. Əynimizə 1-2 dəst paltar götürmüşdik, vəssalam. İndi isə yurd-yuvasız, ev-eşiksiz qalmışdıq. Sonra hər şey yaddan çıxdı. Atamın kənddən çıxdığını görənlər olmuşdu. Qardaşımla dayım isə kənddə qalmışdılar. Buradan çıxmaq fikirlərinin də olmamasını deyiblər. Əliyalın, silahsız-sursatsız... Kənddə hamının evlərinin köçürülməsinə kömək edib özləri qalmışdılar. Daha bir kəndçimizin onlarla olduğunu deyirdilər. Bildiklərimiz bu qədər idi. Qaralar geyib, göylər örtdük. Hər an xəbər gözləyirdik. Qohum-əqraba bir yerə yığışıb çıxış yolu axtarırdılar. Əlimiz heç yana çatmırdı. Böyük dayım gəldi. Rəngi tutqun, qapqara idi. Yola çıxacağını, necə də olsa, onların arxasınca gedəcəklərini söylədi. Nənəm ayağa qalxıb “özüm gedəcəm” – dedi.

Bir haşiyə çıxım. Bir payız gecəsi idi. Qardaşımla mən əmimgildə qalmışdıq. Evlərimiz yaxın olsa belə, biz uşaqlar bir-birimizin evində gecələməyi çox sevirdik. Gecənin bir yarısı əmimin yoldaşı ilə xısın-xısın danışığını eşitdik. Daha sonra gir-çıx, qapı açılıb-örtülürdü. Çöldən başqa səslər də gəlirdi. Böyüklər bizdən gizləsə də, sonra öyrəndik ki, kimin evində silah varsa, yığırlar. Əlbəttə, kənddə hamı bir-birini beş barmağı kimi tanıyır, kimin silahı olub-olmadığını hamı bilirdi. Çünki ov mövsümü başlayanda ov həvəskarları bir yerə yığılıb ov ovlayar, quş quşlayar, qəniməti birgə bölərdilər. Əmim silahını meşəyə aparıb orada gizləməli oldu. Yəqin çox adamlar belə etmişdi. Elə bir dövr idi ki, heç nə anlamaq, başa düşmək olmurdu. Axı hamı vəziyyətin gərgin olduğunu bilirdi. Bəs onda silahları niyə yığırdılar? Kim yığırdı? Hansı məqsədlə yığılırdı? Əhalini silahlandırmaq əvəzinə niyə tərkisilah edirdilər? Daha sonra qınanacağıq – niyə torpaqları qoyub çıxdınız? Son damla qanınıza qədər niyə döyüşmədiniz?

Haqlıdırlar... Doğrudurlar… Bu haqların, doğruların arxasında sadə əhalinin bilmədikləri çox şey vardı. Kimlər və niyə edirdilər bunları? Nə məqsədlə edirdilər? Bu hərəkətlərin arxasından əhalinin köçürülməsi də, indiki ayıq başla baxanda, sanki məqsədyönlü imiş.

...Nənəmin cürəti mənə də sirayət etdi. Mən də onlarla gedəcəyimi dedim. Nədənsə narazı olan olmadı, ya da mən xatırlamıram. Hər şey tez bir zamanda və dumanlı baş verirdi elə bil. Bəlkə mənim xəyallarım, yaddaşım dumanlanıb? Xatırlamadığım, yaddaşımdan silinib gedən çox şeylər var? Biz necə, nə vaxt yola düşdüyümüzü bilmirəm. Amma yolda idik. Mən bizim Qayğı qəsəbəsinə qədər gedib çıxdığımızı xatırlayıram. Dayım kəndə getmək üçün maşın axtarırdı. Hamı başını buladı. Heç kəs risk etmirdi. Çıxış vardı, giriş yox idi. İcazə verilmirdi. Daha sonra qəti olaraq geri dönməyimizi tələb etdilər. Bir-iki həftə əvvəl gördüyümdən də acınacaqlı, dəhşətli görünürdü hər şey. Yalnız zirehli texnika, hərbçilər, yenə yüklə dolu maşınlar... Tozlu, torpaqlı yollarda bu taydan o tayı görmək olmurdu. Orada nə qədər qaldığımızı xatırlamıram. Biz geriyə – Güləbirdə qayıtmalı olduq, maşında sürücüdən əlavə bir nəfər də oturmuşdu. Ləhcəsindən rayon adamına oxşamırdı. Yəqin ki, köçürülənlərə “kömək” üçün əldən-ayaqdan gedən mülki şəxs kimi sürücüylə əlbir idi. Bu insanın içkili olduğu illərdir gözlərim önündədi. Gecəni bu kənddə qaldıq. Dayımın qərarını gözləyirdik. Bizi bir nəfər öz evinə apardı. Məlum oldu ki, kəndin dükançısıdı. Evdə divarlardan və dəmir çarpayıdan başqa heç nə yox idi. Bir də nimdaş bir yorğan vardı. İşıq yanmırdı. Göz-gözü görməyən qaranlıq gecədə neft çırağının işığında oturmuşduq. Nənəmlə mənə bir az dincəlməyimizi deyib ev sahibi ilə dayım çölə çıxdılar. Biz çarpayıda uzandıq. Çox vahiməli gecə idi. Adama elə gəlirdi ki, tanklar birbaşa evin üstünə gəlir. Atışma səsi gəlməsə də, zirehlilərin səsi göz qırpmağa belə imkan vermirdi. Onlar da şəhərdən çıxardılırdı. Həyətdə kişilərin səsi gəlirdi. Yüksəkdən danışır, müzakirələr aparırdılar. Dəhşətli fikirlər məni bürümüşdü. Heç zaman bu günə qədər etiraf etmədiyim şeylər beynimi deşirdi. “Birdən geri dönə bilmədik. Əsir düşdük, ya həlak olduq. Axı bunun üçün vəziyyət tam real idi. Fikirləşirdim ki, dar məqamda yağı əlinə keçməmək üçün ölüm ən mükəmməl çıxış yoludur. Düşmən düşmənə demədiyini qəlb qəlbə deyir həmişə. Nədənsə fikirləşirdim, belə bir an gələrsə dayıma deyəcəm məni öldürsün... etməzsə – “nənəm çox cürətli, kişi qeyrətli qadındı, öhdəsindən gələcəkdi” – deyə “rahatlanırdım”.

Səhər sübh tezdən yenə yolçuluğumuz başladı. Bakıya qayıdırdıq. Yollardan keçib gedənlərdən dayım kəndçilərimizi axtarıb taparaq qardaşımla dayımı soraqladısa da, “gördüm” deyən olmadı. Bu illər ərzində 16 yaşlı bir

qızın nədən özünü belə bir təhlükəyə, riskə atması mənə hələ də çatmır…

Bakıya qayıdanda çox üzücü xəbərlər eşitdik. Qohumlardan, həmkəndlilərimizdən, tanışlardan yaralananlar, ölənlər, daha sonralar əsir düşənlər vardı... El-oba top atəşindən sonra ətrafa dağılmış qəlpələr kimi pərən-pərən olmuşdu. Artıq 18 mayda Laçının işğalını, süqutunu elan etdilər. Hissləri, emosiyaları ifadə etmək, fikirlərlə, sözlərlə çatdırmaq inanılmaz dərəcədə çətin, ağır, ağrılı və ürək dağlayandı. Bu xatirələrin arxasında göz yaşları, hıçqırtılar, yeri-göyü yandıran ağılar, ayrılıqlar, itkilər, əsir düşmüş ruhlar, ayaq altında, tapdaqlarda qalmış torpaqlar və o torpaqlarda qalmış qəribsəmiş qəbiristanlıqlarımız var.

Torpaq həsrəti 26 ildir bitmək bilmir. Mən bu yazımla xəyallarımın qanadlarında xatirələrimin bələdçiliyi ilə səyahətə çıxdım. Bu səyahətimin bir gün, nəhayət, reallaşaraq həqiqi bir səyahətə çevriləcəyini ümidlə gözləyirəm. Övladlarımın əllərindən tutub addım-addım böyüdüyüm torpaqda doğulduğum evi, həyəti, oxuduğum məktəbi – qoy lap xarabalıqları olsun – göstərmək istəyirəm. Bir vaxtlar dəstə-dəstə biçənəklərdən yığdığım bənövşə-nərgizdən, qərənfildən, novruzgülündən, səhləbdən, xarıbülbüldən dəstə tutum. Min bir dərdin dərmanı olan otlarımızdan, çiçəklərimizdən – kəklikotu, qantəpər, qaymaqçiçəyindən, qırxbuğumdan, bağayarpağından yığıb sınmış, yara bağlayıb az qala hər gün qövr edən qəlblərimizə məlhəm edib acıdan acı ayrılıqlarımızın əzabını çıxmaq istəyirəm. Artıq oxşar, ermənilərin “Berdzor” adı ilə yaydıqları şəkilləri deyil, öz ayaqları ilə gəzdikləri, gözləri ilə gördükləri təəssüratları bölüşməklərini görmək istəyirəm. Doğma torpağımıza dizin-dizin sürünüb öpərəkdən getmək istəyirəm. İllərdir yalnız yuxularımda getdiyim, ancaq öz evimizə, qapının kandarından belə girmədən, iri quduz itlərlə əhatə olunmuş həyətimizə ayaq qoymadan qorxub dili batmış vəziyyətdə deyil, axar suların, cəh-cəh vuran quşların, gecələr qulaq batıran uğultusundan qorxub başımı yastığın altında gizlədərək açdığım küləkli səhərlərə, ulduzları sayrışan qışda şaxtalı, yayda gündüz nə qədər isti olsa belə, axşamları sərin, yorğanda yatdığım gecələrə, şehli səhərlərə qovuşaraq ayılmaq istəyirəm. Doğma Alıquluma gedib onsuz yaşadığım 26 ilin əzablı, acılı, dərdli, kədərli günlərinin yığılıb qalaqlanmış ağırlığını dağları lərzəyə gətirən bağırtımla oyatmaq, silkələmək istəyirəm. Bir azca da həyatımızda baş vermiş dəyişikliklər, sevinclər, unudulmaz günlərimi bölüşmək istəyirəm. Oxşamaq, əzizləmək, hər daşı, kəsəyi üçün darıxdığımı və sonda yetişdiyimi bildirmək istəyirəm. Və ona namərdcəsinə arxa çevirib uğrunda ölmədən “qaçqın, köçkün” adına sığınaraq əzilib yaşadığım üçün bağışlanmağımı xahiş etmək, üzərində diz çöküb üzr istəmək istəyirəm. Laçına getmək, dönmək istəyirəm.

**OVQAT**

## VƏTƏNİN ŞƏHİD GÜLÜ
*20 Yanvar şəhidlərinin xatirəsinə*



Mən sizə bir gül haqqında danışmaq istəyirəm. Toyların, nişanların, gözəl ziyafətlərin bəzəyi, sevgi-məhəbbət rəmzi, ad günlərinin hədiyyəsi – xoşbəxt bir güldən. Görüşə gedən gənclərin əllərini, sevgili gözəllərin tellərini bəzəyən, yaşıl kövrək yarpaqları, qırmızı incə ləçəkləri görən gözləri işıqlandıran güllər gözəlindən. O güldən ki, onu sevənlər, ona könül bağlayanlar çox idi. Sevənlər ilk sevgilərini bu güllərə pıçıldayar, sevdiklərinə könül açmamış, ona könül açar, ondan xeyir-dua alardılar. Elə ilk görüşə də onunla gedərdilər.

Neçə-neçə sevənlər qovuşdurmuşdu bu gül. Neçə-neçə könüllərdə məhəbbət ocağı qalamış, neçə sevgilərə şahid olmuşdu...

Bu il elə bil Tanrı bu gülləri yağış kimi yağmışdı. Bakının hər kəndi bu gülə vurulmuşdu elə bil.

Hamı mehrini ona salmışdı sanki.

Onlar 71 il imperiya əsarətində qalmış bir xalqın azadlıq arzuları idi. Bu qırmızı arzular sanki üsyan eləmək üçün hər tərəfdə gül mitinqinə toplaşmışdı.

Həmin o gecə, qanlı-qadalı qış gecəsi – şəhərə qar yerinə qan yağışı yağdı. O gün səhər günəş yox, ölüm doğdu şəhərə. Mənim qəhrəman xalqım bu qan yağışını gül yağışı ilə yudu. Həmin gün qanına qəltan olmuş sirdaşlarının qanına qarışdı gülüm. O gün Vətənimin övladları kimi, torpağında bitən çiçəyi də sevdiklərinə biganə qalmadı. Şad günündə həmdəmi olduqları azadlıq qaranquşlarının nəşi üstünə yağdı. Bəli, Vətənimizin azadlığı uğrunda şəhid olan oğul və qızlarımızla bərabər bir gülü də şəhidlik zirvəsinə ucaldı.

O vaxtdan düz 28 il ötür. O vaxtdan o gülümün də ünvanı dəyişib. Daha o, toylara, nişanlara getmir. İndi o, öz könlünü bu dünyadan nakam köçən azadlıq qaranquşlarına bağlayıb. İndi bu gül başını Vətən uğrunda şəhid olmuş fədailərin köksünə qoyaraq, onların yarımçıq qalmış arzu və istəklərini dinləyir, həmdəmi olur Qərənfilim!

**QƏRƏNFİLİM**

Şəhidlərin yaşıdı,
Şəhid adı daşıdı.
Çiçəklərin başıdı,
Başıdı qərənfilim.

Deməyin ki, naşıdı,
Dərdimin sirdaşıdı.
Tariximə hörülən
Əbədiyyət daşıdı,
Daşıdı qərənfilim.

Vətənimin xoş adı,
Onun tacı Şuşadı.
Fərizəylə qoşadı,
Qoşadı qərənfilim.

Yurdumun qəhrəmanı,
Oldu yadda qalanı.
Xalqa gələn bəlanı
Onunla bir yaşadı,
Yaşadı qərənfilim.

Dərdimə ortaq gülüm,
Qürurlan, qoçaq gülüm.
O gün əbədiyyətə
Apardı sizi ölüm.

**20 YANVAR GÜNÜ**

Əllərdə qərənfil yağışı yağdı,
Şəhidlər qanıyla sulandı torpaq.
Vətən qarşısında siz ucaldınız,
Başınız ucadır, üzünüz də ağ.

Püskürdü vulkantək yüzillik kinim,
Qırmızı libasa büründü şəhər.
Ayaqlar altında inlədi zülüm,
Bir-birə qarışdı, sevinc və kədər.

Tarixə yazıldı xalqımın adı
Qızıl hərflərlə o şərəfli gün.
Azadlıq yolunda səfərbər oldu,
Uşaqlı, böyüklü millətim, bütün.

**Nailə MARKSQIZI,**
***Laçın rayon İmanlar kənd ümumi orta məktəbinin müəllimi***

**POEZİYA**



## QƏNBƏR MİKAYILOV

*Qənbər Əkbər oğlu Mikayılov əslən Laçın rayonunun Şamkənd kəndindəndir. Ailəsi Şəmkir rayonunun Nərimanlı kəndində məskunlaşıb. 2005-ci ildə bu kənddə doğulan Qənbər hal-hazırda VII sinifdə oxuyur. Hərdən hisslərini, duyğularını uşaq həssaslığı ilə vərəqlərə köçürür. Ən çox da Laçın haqqında yazır. İndiyədək ancaq şəkillərdə gördüyü Laçına böyük sevgisini hələ "qolu-qanadı yaxşı bərkiməmiş" kövrək misraların köməyi ilə çatdırmaq istəyir.*

### LAÇIN

Atımı yəhərləyib
Bir gün yola çıxacam.
Mən Laçında olanda
Dağ başına qalxacam.

Gəzəcəm kənd-kənd, el-el,
Gəzəcəm addım-addım.
Deyəcəm, ey Laçınım,
Səni heç unutmadım.

Qayıdacam Laçına,
Rahat yata biləcəm.
Ən böyük sevincimi
Dostlarımla böləcəm.

### ***

Yollarında, dağlarında
Güllərimiz açardı.
Atlarımız qaçardı,
Quşlarımız uçardı.

Qanım qara Laçınsız,
Qəlbim para Laçınsız.
Yer tapmıram özümə,
Gedim hara Laçınsız?

Gəzəmmədim yollarımda,
Gəzəmmədim dağlarımda.
Gəzəmmədim Laçınımda,
Dözəmmədim Laçınsız.

Burdan düşməni qovub
Ordum zəfər çalacaq.
Laçın bizim olubdu,
Yenə bizim olacaq.

**PUBLİSİSTİKA**

## ÖTƏN ƏSRİN QƏHRƏMANLARININ RUHU BİZLƏRİ BAĞIŞLAYACAQMI?

Kişi adı yalnız hərfi məna daşımır, kişi adı həm də torpaq, Vətən, el-oba qeyrəti çəkənlərə, insanlar üçün faydalı işlər görməyə can atanlara, bu yolda canını qurban verənlərə şamil edilmişdi. Mən bu teoremi isbat etmək iqtidarında deyiləm...

Adamın arxalandığı, inandığı güvənc bir yeri olanda, baş verən hadisələrə, ötən günlərə görə ürəkli olursan, iftixar hissi ilə öyünürsən. Bəzən də arxayınlaşaraq başımızın altına yumşaq yastıq qoyuruq. "Qoyunu qurda tapşırmaq" kimi atalar sözü adamın yadına düşür. Birdən də iş-işdən keçəndən sonra gözlərimizi yumub-açanda görürük ki, böyük bir fəlakət qapımızın ağzını kəsibdi. İş-işdən keçəndən sonra heyifsilənirik, bu da fayda verməz – deyiblər...

Tarixən bu hadisələrə görə çox öyünmüşük. 1919-cu ilin fevral ayında Zabux dərəsində (Laçın rayonu) erməni generalı, müsəlmanların qatı düşməni olan, tayqulaq Andranikin 30 minlik daşnak ordusunu 1871-ci ildə Zəngəzur qəzasının Qasımuşağı obasında (hazırda Laçın rayonunun Qurdqajı kəndində) anadan olmuş Sultan bəy Paşa bəy oğlu darmadağın etmişdi.

O vaxtlarda bu hadisələri görənlər deyirdilər ki, ermənilərin meyitlərinin iyi, qoxusu düz beş il "Qanlı dərə" adlanan bu yerlərdən çəkilməyibdir. Bu mənzərəni ancaq qurd-quş sona çatdırmışdı. İyin, qoxunun dərdindən buralarda yaşayan sakinlər epidemiyadan uzaq olmaq üçün bir müddət məkanlarını müvəqqəti olaraq dəyişməli olmuşdular. Bu xof bütün erməniləri lərzəyə salmış, qorxudan canlarına vəlvələ düşmüş, başlarını götürüb qaçmağa məcbur olmuşdular.

Sultan bəyin adı gələndə gizlənmək üçün siçan yuvası axtarıb özlərini ora "soxmağa" məqam axtarırmışlar. Hələ bir müddət erməni ailələrində təzə anadan olan uşağı tərbiyə etmək məqsədi ilə bu yönümdə yetişdirmək, qorxutmaq üçün "ay dığa", "susura" "türk yeqala" – deyə tənbeh edərmişlər. Müsəlmanları, türkləri özlərinə düşmən obrazında, adam öldürən, qaniçən kimi tanıdan erməni valideynlərinin tərbiyə verdiyi, böyütdüyü "dığa" da bu cür düşmən xislətli olmalıdı, bu ənənəni tarixi boyu yaşatmağa çalışacaqdılar.

XX əsrin ilk günlərindən Qarabağda "Böyük Ermənistan" yaratmaq xülyasının qarşısı məhz Zabux dərəsində (Laçın rayonu) Sultan bəy Paşa bəy oğlunun təşkil etdiyi dəstənin qəhrəmanlığı ilə alınmışdı. Andranikin

Qarabağı, sonra isə Gəncəni işğal etmək, Stepan Şaumyanın bolşevik-daşnak hərbi hissələri ilə birləşərək Şimali Azərbaycanda erməni hakimiyyəti qurmaq planı alt-üst olmuşdu.

...Artıq bolşeviklərin Qızıl Ordusu Azərbaycanı sovetləşdirməyə gəlmişdi, Sultan bəyin Hacısamlı kəndində olan çay mülkünə nəzarət edirdi. Sultan bəy isə başının dəstəsi ilə üzbəüzdəki meşədə, Şəlvə çayının sol yamacında qərar tutmuş, Kər-kordan meşəsinə sığınıb, tərk etməyə məcbur olduğu evini, illər boyu əkib becərdikləri, min bir qayğısını çəkdiyi bağı uzaqdan müşahidə edirdi. Bir o qədər göstərdiyi qəhrəmanlıq şücaətinə görə heyifsilənmədi. Ancaq axırdan-axıra bərk kövrəlmişdi, bilirdi ki, Qızıl Orduya gücü çatmaz. Odur ki, Sultan bəyin ürəyi dolmuşdu, dərindən nəfəs alıb bir bayatı çağırdı:

*Əzizinəm, yar qana,*
*Yar dərdini yar qana.*
*Aləmə sığmayan canım*
*Sığınıbdı yarğana.*

Çar Rusiyası iflasa uğradıqdan sonra bolşeviklər hakimiyyətə gəlməli idilər. Onlardan miras qalmış bəzi adət-ənənələri, qanunları, idarəetmə işlərini davam etdirməyə məcbur oldular. Çünki fəaliyyət göstərmək iqtidarında deyildilər, savadlı kadrlara böyük ehtiyac vardı, əsas strateji məramnamə yoxdur, yenisini işləyib hazırlamaq lazım idi. Qafqazda xeyli tayfalar, millətlər yaşayırdı, onların arasında azərbaycanlılar çoxluq təşkil edir, ipə-sapa yatmırdılar, bəzən qanunlara tabe olmaqdan boyun qaçırırdılar. XI Qızıl Ordunun gücündən istifadə edərək adamları, dinc sakinləri öldürərək Bakını işğal etdilər. Ordunun tərkibində erməni millətindən olan əsgərlərin, zabitlərin sayı çox idi.

Zaqafqaziya Bolşeviklər Partiyasının xətti ilə Xəzər dənizi sahili boyunca muxtariyyət təşkil olunmasının qarşısının alınması üçün Nəriman Nərimanov müəyyən məsələlərdə Leninlə razılığa gəlmək məcburiyyətində qaldı.

Ancaq sonralar azərbaycanlıların yaşadıqları dədə-baba torpaqlarının üzərində Ermənistan SSR-in bərqərar edilməsinə nail olan bolşeviklər ingilisləri, türkləri sıxışdırıb sərhəddən yola saldılar.

Bir yandan da keçmiş SSRİ-nin "Xalqlar dostluğu" şüarı başımızın üstündə dalğalanaraq başımızın altına yumşaq yastıq qoydu.

Fevral ayının 23-ü, SSRİ Silahlı Qüvvələrinin yaranması günü kimi bayram edilirdi. Bu bayrama bəzən kişilərin bayramı da deyərdik və bir-

birimizi təbrik edərdik. Həmin vaxtlarda bir xəbər ildırım sürəti ilə hər tərəfə yayıldı ki, Xankəndində 1988-ci ilin 23 fevral günündə SSRİ Silahlı Qüvvələrinin yaranması günü nümayişində ermənilər "Böyük Ermənistan" yaratmaq xülyası ilə arzularını bildiriblər. "Qarabağ bizimdir" şüarları səsləndirməyə başlayıblar. Bir neçə gün çəkən bu nümayişə Moskva "Vremya" proqramı vasitəsilə xalqların oyanması, demokratiya, müstəqil idarəetmə donu geyindirdi.

Kərkicahan kəndi inkişaf edib böyümüşdü. Burada yaşayan azərbaycanlıların çox hissəsi Xankəndində fəaliyyət göstərən idarə, müəssisələrdə, zavodda və fabriklərdə işləyirdilər. Xankəndi şəhərdaxili avtobus marşrutu kəndə qədər gedib-gəlirdi. Bu işlərdən xəbəri olmayanlar təzyiqlərə məruz qalmağa başladılar. Xəsarət alanlar da oldu. Kərkicahana gedib-gələn avtobus marşrutu kəsildi. Adamlar kəsə yollarla Şuşaya üz tutdular. Fövqəladə vəziyyət elan olundu. Arkadi Volsk hakimiyyətdə söz sahibi olmağa başladı. SSRİ Ali Sovetinə deputat seçilmək üçün şuşalı seçicilərin görüşünə gəldi. Xalqların, millətlərin dostluğu haqqında moizə oxudu. Sözü ağzında qaldı, tribunadan salındı, Şuşadan qovuldu. Bu hadisəyə görə Şuşada yaşayan xeyli sakinlər incidildi, ora-bura çağırılmalı oldular.

Xatırladım ki, münaqişələr başlayana qədər Laçında bir neçə erməni ailəsi yaşayırdı. Qurqen Engels adına kolxozun sədri, sonra Rayon Mərkəzi xəstəxanasında, təcili yardım stansiyasında feldşer, onun həyat yoldaşı Anna isə xəstəxananın doğum şöbəsində mamaça-tibb bacısı işləmişdi. Qurqen və onun arvadı Anna sonralar öyünürmüşlər ki, biz öz vəzifə borcumuzu "yerinə yetirdik". Azərbaycanlılardan qisasımızı almışıq. Oğlu Seryoja isə Laçın rayonunun inzibati ərazisinin meşələrində ağacların başına ağ parça bağlamaqla hava ilə Xankəndinə uçan vertolyotlara istiqamət verirmiş. Kinkor usta, arvadı Verenka yol idarəsində partkom, Arfeniya 1 nömrəli Laçın şəhər orta məktəbində müəllimə, Tamara isə mağazada satıcı idi. Onlara "gözün üstə qaşın var" deyən olmadı. Çünki, biz azərbaycanlılar SSRİ-nin xalqlar dostluğu ideyası, tərbiyəsi ilə böyüyüb yaşayırdıq. Erməni ailələrindən bir nəfərin də "burnu qanamadı". Özləri yəqin ki, işlərini bizdən qabaq bilirmişlər, odur ki, sakitcə köçüb aradan çıxdılar.

Hər gün səhər tezdən yuxudan qalxanda yeni bir xəbər eşidirdik. Azərbaycanlılara və onların yaşadıqları kəndlərə təzyiqlər, basqınlar təşkil olunurdu. Bunları xüsusi təlim keçmiş üzdəniraq, vəhşiləşmiş, qəddar saqqallı ermənilər təşkil edirdi.

Laçın şəhərində "Köhnə poçt" adlanan məhəllədən dörd yol ayrılırdı. Şuşaya, Qubadlıya, Kəlbəcərə və Ermənistanın Gorus rayonuna buradan gedib-gəlmək olardı. İlk gündən qonşular dayaq məntəqəsi kimi burada növ-

bə çəkdilər. Ermənistan SSR-in sərhədləri ilə qonşu olan kəndlərdə də sakinlər birləşərək dayaq məntəqələri (postlar) yaratdılar. Bir nəfər də olsun "erməni dığası" Laçın rayonunun ərazisindən icazəsiz Xankəndinə gedib-gələ bilmirdi. Hərbi vertolyotların, təyyarələrin uçması məhdudlaşdırılmışdı. Qırxqız dağlarında, Kotan qayanın üstündən uçan təyyarə dağa dəymiş və qəza nəticəsində məhv olmuşdu. Ancaq çox təəssüf ki, erməniləri sovet hərbçləri himayə edirdilər.

"Köhnə poçt" adlanan məhəllənin ən hündür yerində 1941-1945-ci illərdə Böyük Vətən müharibəsində həlak olan laçınlıların xatirəsini əbədiləşdirmək üçün Xatirə kompleksi inşa edilmişdi. Gözəl mənzərəli bu yerdən baxanda şəhərin hər yeri görünürdü. Ağaclar, bəzək kolları və güllər gözəl bir mənzərə yaradırdı. Yüz pilləkəni addımlamaq adamları daha da qürrələndirirdi. İkinci Dünya müharibəsində yüzlərlə laçınlı öz qanı, canı ilə Böyük Qələbəni yaxınlaşdırmışdı. Neçə-neçə həmkəndlilərimiz yaralanaraq əlil olmuşdular, neçə-neçə həmyerlimizin hələ də "qara kağızı" gəlməmişdi. Onların yolunu gözləyənlərin gözləri yollara dikili qalmışdı.

Yüz pilləkənə çatmamış sağ tərəfə dönüb baxmasan, Ana abidəsini ziyarət etməsən, heykəlləşmiş, daşadönmüş Ana və onun qucağındakı körpə səndən küsər, səni bağışlamaz...

Hər gün sübhdən günəş Laçın dağlarının başı üstündən boylanıb mürgülü gözlərini ovuşdurur. Şəfəqlərini darayıb Ana abidəsini yuxudan oyadır. Sonra onu salamlayır.

– Salam, Ana. Necəsən? Bu gecə necə rahatlanmısan, günün ağrılarına necə tab gətirmisən?

Ana abidəsi də analar kimi günün acısını, şirinini qəbul edir, dinmir, danışmır. Gecələr ağlayır, sızlayır ki, eşidən olmasın.

Özünü o yerə qoymur, başını aşağı salıb körpəsini oxşaya-oxşaya sevməyinə davam edir, dizi üstə əyləşdirir. Ana həmişə günəşin üzünə şax baxır, körpəsinin gözləri qamaşmasın deyə onun yerini dəyişdirir, bu dizinin üstündən alıb o birisinə qoyur.

Ana abidəsi analara olan hörmət, məhəbbət, sədaqət, etiqad rəmzidir. Üzündə ismət hissi olan analar övlad, Vətən, torpaq yolunda hər cür əzab-əziyyətə qatlaşıb, möhkəmləşib, axırda da heykəlləşib Laçında qaldı.

**31 iyul 1989-cu il.** Günəş bu gün küskün idi. Ana abidəsini oyatdısa da, içində bir göynək, yanğı vardı. Ona baxıb gülümsədi, ancaq bu elə gülümsəmə deyildi, elə bil ürəyinə nə isə dammışdı. Buna baxmayaraq, Ana körpəsini yenə adəti üzrə yuxudan oyatdı, sevə-sevə oxşadı. Körpə gözlərini açdı. Ana yenə körpəsinin gözləri qamaşmasın deyə onu əks tərəfə çevirdi. Körpə bu gün günəşə baxmaq istədi, artıq gec idi. Ana onun yerini çoxdan

dəyişmişdi, çevrilib arxaya, günəşə baxmaq istədi, başını çevirib baxdı, amma o da hiss etdi ki, bu gün günəş hərgünkü günəş deyildi. Küskün idi, rəngi də dəyişmişdi. Sanki bu gün Laçında, Ana abidəsinin başına nə isə bir hadisə gələcəyi ürəyinə dammışdı.

Bu günü həyəcanlı adlandıraqmı, yoxsa dəhşətli desək daha dəqiq olar? Bəli, həmin günün axşamı Laçında olan vəziyyəti dilə gətirmək belə dəhşətdir.

Uzun aylardan bəri Dağlıq Qarabağla əlaqədar hadisələrin təşvişi ilə yatıb-duran, daim əsəbi gərginlik keçirən, bu münaqişələrin nə ilə qurtaracağını bilməyən adamlar yenə də həyəcanlı, narahat idilər.

Hadisələr Zabux dərəsindən, Həkəri çayından Laçına doğru avtomat atəşlərinin tükürpədici səsindən başladı. Erməni ekstremistlərini müşahidə edən Sovet Ordusunun hərbçiləri patrona qızırğalanmırdılar. Ermənistan SSR-in Gorus rayonu istiqamətindən 15-20 yük dolu maşınlar guya Xankəndi şəhərində yaşayan ermənilərə humanitar yardım, tikinti-inşaat materiallarını çatdırmaq üçün Laçından keçməli idilər. Yük maşınları saxlanarkən müəyyən olmuşdur ki, yükün altında hərbi sursatlar vardır. Bundan Sovet Ordusunun əsgərlərinin xəbəri olmamışdı. Adamlar bu səs-küyə görə küçələrə tökülüşmüşdülər. İlk yaralanan Gürcüstan SSR-in Bolnisi rayonundan olan inşaatçı-tələbə, ADU-nun fizika fakültəsinin tələbəsi Məhəmməd qıçından, başından, ümumiyyətlə üç yerdən yaralanmışdı. Tələbənin "günahı" bu idi ki, atəş səsinə yaşadığı Əvəz Verdiyev adına Laçın şəhər orta internat məktəbinin həyət qapısına yaxınlaşıb qarışıqlığın, atəşin səbəbi ilə maraqlanmışdı.

12 uşaq anası Ayna Quliyeva Laçın şəhərinin "Köhnə poçt" adlanan məhəlləsində yaşayırdı. Ana küçəyə çıxmaq istəyirdi ki, körpə balalarından bir xəbər bilsin, onları bu qorxulu yerdən uzaqlaşdırsın. Lakin, elə bu vaxt namərd gülləsi onun qıçını parça-parça etdi.

Bu vaxt Ana abidəsi öz balasını bağrına basdı, o da Ayna ana kimi istəmirdi ki, güllə onun balasına dəysin. Anaların fəryadı, günahsız adamlara atılan güllələrin səsini eşidilməz etdi.

Balaca Hikmət Abbasova, müəllim Heydər Cəfərova güllə öz həyətlərində, yeniyetmə Faiq Əlbəndova isə şəhərarası avtobus gözlədiyi yerdə dəymişdi. Yaralananların siyahısına Abuzər Bayramovu, Vahid Bağırovu, Zakir Məmmədovu, Taleh Bayramovu və başqalrını da əlavə etmək olar. S.M.Kirov küçəsi, 3 nömrəli evin 18-ci mənzilinin (sahibi Firəngiz Həşimovadır) pəncərəsini deşən güllə pərdəni yandıraraq keçib tavana dəymiş, evdə yanğın hadisəsi baş vermişdi. Neçə mağazanın şüşəsi çilik-çilik olmuş, bufetçi Yaqub Şükürovun "QAZ-24", milis mayoru Rafiq Novruzovun

"Niva" markalı maşını, şose yolun üstündəki təbii qaz xəttinin boruları xəlbir kimi deşik-deşik edilmiş, Bayram Baxışovun "Zaporojets"ini zirehli hərbi maşın konserv qutusu kimi yoğurub yığmışdı bir yerə.

Erməni ekstremistləri tərəfindən qızışdırılmış saqqallı "əsgərlərin" gülləsinə nə üçün ana hədəf olmalı idi? Bu bir yana, Laçın və onun sərhəd kəndlərinə basqın edən saqqallı erməni terrorçuları Sovet Ordusu üçün istehsal olunan müasir silahlarla yaraqlanmışdılar. Onlara silah verən hərbçilərin fikri nə idi görəsən? Bunu kimdən soruşmalıyıq, bu suallara kim və nə vaxt cavab verəcəkdir?

Budur, analar əziz övladlarını Silahlı Qüvvələrdə xidmət etməyə yola salmağa belə qorxurlar. Qorxurlar ki, balalarını son zamanlar orduda baş verən qanunsuzluqlar, özbaşınalıqlar əllərindən ala bilər.

İndi hər bir ana övladını hərbi xidmətə qorxa-qorxa yola salır, məcburiyyət qarşısında qalıb dilucu razılıq verir. Arxasınca su atmaq da yadından çıxır. Ayna ana ürəyindən keçənləri dilinə gətirir:

– Görəsən, mənim oğlum əsgərliyə gedəndə hansı millətçi komandirin əmri ilə hansı günahsız anaya güllə atacaqdır?

Ayna ana qoltuq ağaclarının köməyi ilə yaralı Ana abidəsinin yanından keçəndə, yaralandığı yerdə, abidənin qarşısında ayaq saxlayır. Həmişə gözləri dolur, ürəyini yaralı Ana abidəsinə boşaldır. Heç olmasa onun daş dərdlərinə şərik çıxmaq istəyirdi. Pıçıltısını ancaq o eşitdi:

– Görəsən, biz anaların nə günahı vardı? Mən insanam, deyə bilərlər ki, haradasa səhv eləmişəm. Bəs bu dilsiz-ağızsız daşlar nə günahın sahibidirlər görəsən?!

Yaralı Ana abidəsinin daş gözlərindən yaş yanağı ilə dığırlanıb havadaca donub yoxa çıxdı. Daş dodaqları bir neçə dəfə səyridi. Ha çalışdı nə isə desin, bacarmadı. Sözləri eləcə ürəyindəcə qaldı.

Bayaqdan günəş anaların söhbətinə qulaq verirmiş, birdən pıçıldadı:

– Sizin günahınız ancaq günahsızlıqdır. Bir çevrilib arxaya baxın, dövrün haqsızlığı, ədalətsizliyindən başımıza bu oyunlar gəlir. Oyanın, ətrafınıza baxın. Mən elə bilirəm bu güllələr Ayna anaya, Ana abidəsinə yox, bütün azərbaycanlı analara dəymişdir.

Səhərisi gün Moskva televiziyası belə bir xəbər yaydı ki, Azərbaycanın Laçın şəhərində Ermənistan SSR-in Gorus rayonundan Stepanakert şəhərində yaşayan ermənilər üçün humanitar yardım aparan maşın karvanına "basmaçılar" hücum edərək yük maşınlarını yararsız hala salmışdır. Yük maşınlarının sürücüləri xəsarət almışlar, yalnız hərbçilərin müdaxiləsindən sonra sabitlik yaranmışdı.

“Azərbaycan qadını” jurnalının 1990-cu il aprel tarixli 4-cü sayında “Yaralı ana abidəsi” başlığı altında bədii-publisistik yazı dərc olunmuşdur.

Hakimiyyətdə güclü və müstəqil, səriştəli siyasi rəhbərliyin olmaması səbəbindən Dağlıq Qarabağda yaşayan soydaşlarımız öz doğma kəndlərindən köçürülməyə başladı. Köçlər Laçından gəlib keçirdi. Bu günə kimi mərkəzə bağladığımız ümidlərin donu açılaraq suya dönür, sonra isə buxarlanıb yoxa çıxırdı. 1988-ci ildə Qərbi azərbaycanlıların amansızlıqla doğma yurdlarından qovulmasının ardınca Laçın, Kəlbəcər, Qubadlı, Zəngilan rayonlarının boşaldılması qaçılmaz idi.

Dağlıq Qarabağ məsələsini Bakıda oturan hakimiyyət hərisləri də cilovlamaq iqtidarında deyildilər. Onlar da olmayan başlarını itirmişdilər. 1992-ci ildə Laçından olan bir qrup ziyalı səlahiyyətli şəxslərlə görüşmüşdü. Qısa söhbətdən sonra deyilmişdi ki, Laçın üç günə boşaldılmalı, bütün təşkilatların yük avtomobilləri Şuşaya, Laçına göndərilməlidir, yuxarıdan göstəriş var. Bu göstərişi kim vermişdi, onu da bilən yox idi.

Dəlidağın, Qırxqızın, Sarıbabanın, Calbayırın, Kirs dağlarının qoynunda heç nədən xəbəri olmayan əliyalın sakinlər başsız, ağsaqqalsız qalmışdılar. Hərə öz başının hayına qalmışdı. İmkanı olanlar gələn maşınlara pul, xalça, palaz verirdilər ki, heç olmasa ailə-uşaqları, bir dəst yatacağı Qubadlı yolu ilə Arana tərəf apara bilsinlər. 60 min nəfərə yaxın əhali pərən-pərən düşdü, Bakı, Sumqayıt və 58-ə yaxın rayonlara səpələndilər.

Buna baxmayaraq, Laçında yaradılan özünümüdafiə batalyonunda qeyrətli, vətənpərvər oğullarımız döyüşürdülər ki, Ermənistan SSR-in sərhədlərindən hücum olmasın.

Düşmənin baş planına görə, Dağlıq Qarabağın Ermənistanla birləşməsi üçün Laçın dəhlizi açılmalı, sərbəst gediş-gəlişə özləri nəzarət etməli idilər.

Belə də oldu. 26 ildir ki, Laçın dəhlizi ilə Dağlıq Qarabağ Ermənistanla birləşdirilmişdir.

Biz, laçınlılar isə düz 26 ildir ki, yollara, uzaqdan görünən başı qarlı dağlara baxa-baxa qalmışıq. 26 il bir igidin ömrüdür, bu ömrü məcburi köçkün kimi yaşamaq hansı haqqa, ədalətə sığar?

Yetim uşaqlar kimi üzümüzə güləndə bir az irəli soxuluruq, birdən də üzlərini turşudanda məyus halda utanaraq əlimizi arxaya çəkirik, qızarırıq, bozarırıq, haldan-hala düşürük. Belə getsə, yetim uşaqlar kimi küncdə, bucaqda ömrümüzü başa vuracağıq. Torpaqları azad edib o yerlərə qayıtsaq, bəlkə şəhidlərin ruhu bizi bağışladı.

***

Hər bir şəhidin, hər bir Milli Qəhrəmanın, hər bir laçınlının döyüş salnaməsi vardı, laçınlıların döyüş yolu haqqında əsərlər yazılır və yazılacaqdır. Ailə başçısı öz ailəsini döyüş bölgəsindən sağ-salamat çıxara bilirsə, bu özü də fədakarlıqdır.

Tanınmış şair, nasir Nazim Əhmədlinin Laçın hadisələri barədə çoxlu əsərləri vardır. Onların içində bir hekayədəki hadisələr məni bərk tutdu. Məlum səbəblərdən Laçın işğala məruz qalır. Adamlar çıxış yolu axtararaq öz ailə və uşaqlarını döyüş bölgəsindən uzaqlaşdırmağa çalışırlar. Kamran bəy bütün el-obanı yola salır. Kənddə tənha qalır. Azuqəsini və aynalı tüfəngini götürüb mağaraya çəkilir. Bir müddət gecikənlərə, arxada qalanlara da kömək edir, yola salır. Ona nə qədər deyənlər olur ki, Kamran bəy, gəl ətəyindən daşı tök, bizə qoşul gedək. O isə inadından dönmür ki, dönmür:

– Mən kişiyəm, kişi oğluyam, ata-babam da kişi olublar, Qara Murtuzanın şəcərəsi olan kişi torpağı, Vətəni, el-obasını sahibsiz qoyub getməz, mən burada anadan olmuşam, burada da ölüb qalmalıyam.



**Nemət BƏXTİYAR,**
***Azərbaycan Jurnalistlər Birliyinin üzvü,***
***Media "Qızıl Qələm" mükafatı laureatı,***
***Qarabağ müharibəsinin iştirakçısı,***
***müharibə veteranı***

**OVQAT**

## TƏNHA AĞAC

*Gözlərim dikilir çox uzaqlara*
*Yaxınlar, uzaqlar aparır hara?*
*İlantək qıvrılıb yatan yollara*
*Baxıb hey dalıram mən xəyallara.*

*Qalxıb dar cığırla buz bulaqlara,*
*Həsrətin çəkdiyim bir ovuc qara,*
*Göydə qanad çalıb uçan qartala*
*Baxıb hey dalıram mən xəyallara.*

Yollar xəyallar kimidir. Uzandıqca uzanır. Yollar insanları haralara aparmır? Gah dağları, yaşıl çəmənləri, talaları, düzləri, zümrüd bulaqları, meşələri və s. yerləri dolanır. Dolandıqca fikrin də, xəyalların da dolanır.

Geniş bir düzənlikdə, əhatəsində özündən başqa heç bir ağac bitməyən böyük gövdəli qollu-budaqlı bir ağac vardı. Elə bir ağac idi ki, kölgəsi ilə insanları sərinlədir, gözəlliyi ilə ana təbiətə yaraşıq verirdi.

Kərənti ilə otçalanlar, heyvan otaranlar onun kölgəsində dincələrdilər. Süfrə açıb yemək yeyər, buz kimi bulaq suyundan içərdilər. Bu ağacın gövdəsində kimlər, kimlər oturmamışdı. Ağac elə əlverişli yerdə bitmişdi ki, insanlar da bundan istifadə edir, gözəlliyindən doymurdular.

Ağac necə də xoşbəxt idi. Elə xoşbəxt idi ki, kölgəsi insanlarla dolu, çal-çağırlı olurdu.

1992-ci ilin may ayı idi. Kənddəki sakitlik, vahimə ağaca da ayan oldu. Düzənlikdə tənha, yetim qalmışdı. Onu yad edən yox idi. Amma bilmirdi ki, tənha ağacın kölgəsində oturmaq, maraqlı söhbətlərin şahidi olmaq üçün insanların burnunun ucu göynəyir.

Şah budaqlı, iri gövdəli, qürurlu ağac!

Axı sən elə bir torpaqdan qidalanıb böyümüsən ki, torpaq qədər müqəddəssən. Döz, bir az da döz. Çətin günün ömrü az olur.

Laçınımın laçın gözəli, torpağın ilki, əzəli, köklü, qollu-budaqlı ağacım! Darıxma! İnsanların da qürurludur. Tənha qoymazlar səni! Torpaqlarımızı mənfur düşmənimiz olan ermənilərdən azad edəcəklər. Keçmişlə gələcəyimizin birləşdiyi gün gələcək. Sən də əvvəlki kimi çal-çağırlı, toy-büsatlı olacaqsan. Öz yurddaşlarını görəndə kökün, gövdən, yarpaqların xəfif-xəfif gülümsəyər, qollarını açaraq dünyanı qucaqlayarsan.

Köklü ağac güclü insan kimidir. Sən dərdlərini bölüşə bilməyən, Vətən sevgisi olmayanlardan min qat üstünsən. Axı sən də canlısan.

Qəriblikdə yaşayan övladların tezliklə sənə qovuşacaq. Yenə Qarabağı, Şuşanı, Laçını və digər rayonlarımızı doyunca gəzib sənin kölgəndə oturub olanları, vətənində vətənsizliyin nə qədər ağır olduğunu səninlə bölüşəcəklər. O torpağı ayaqyalın, qarış-qarış gəzəcək, yenə sənin kölgəndə dincələcəklər:

*Kök atmısan torpağa*
*“Dəmir caynaqlarınla”.*
*Kök atmısan torpağa*
*Həm ruhunla, canınla.*

*Kökün torpaqdadırsa,*
*Tənha deyilsən, ağac.*
*Rişən torpaqdadırsa,*
*Tənha deyilsən, ağac.*

*Böyük gövdəli ağac,*
*Barlı-bəhərli ağac.*
*Möhkəm yapış torpaqdan,*
*Tənha qalmazsan, ağac.*

## GÖYQURŞAĞI

– Musiqidə neçə not var?

– Yeddi.

– Bəs göyqurşağının neçə rəngi var?

– Əlbəttə yeddi.

Yeddi rəqəmi müqəddəs rəqəmlərdəndir. Dünyanın bir çox möcüzələrini, sirlərini özündə gizlədən “7” rəqəmi.

Nərmin də bu möcüzələrə inanırdı. Hər yağış yağanda sevinirdi. Çünki hər yağış yağandan sonra göyqurşağı çıxırdı. Göyqurşağının rəngləri necə də gözəldir. Qırmızı, narıncı, sarı, yaşıl, mavi, göy, bənövşəyi. Sanki göyün üzündə körpü salınmışdı. Elə bir körpü ki, heç bir körpüsalan, əla bacarığı olan insan belə bunları edə bilməzdi. Allahın yaratdığı bu möcüzələr Nərmini sehrlər aləminə aparırdı.

Yeddi rəng. Yeddisinin də qalınlığı, ölçüsü eyni idi.

Nərmin Sayalı nənəsindən eşitmişdi ki, göyqurşağının altından keçəndə bütün arzuların gerçəkləşir.

Nərmin öz uşaqlıq yoldaşlarını, oynadıqları yerləri arzulayırdı. Girov qalan torpaqlarımızın geri qaytarılmasını istəyirdi!

Uşaqlıqda tez-tez “Evcik-evcik” oyunu oynayırdılar. Evlərin yerlərini dəyişirdilər. Kaş indi də oyun oynayaydılar, evləri geri qayıdaydı.

Balaca Nərmin nənəsinə tezliklə Qarabağa gedəcəyini söylədi. Nənəcan, yağış yağandan sonra göyqurşağı çıxacaq. Mən həmin göyqurşağının üstünə çıxacağam. Gözlərimi yumub yeriyəcəyəm. Dayananda biləcəyəm ki, öz kəndimizə çatmışam. Axı, göyqurşağı həmişə bizim kəndimizdə çıxırdı.

Nənə Nərminin başını sığalladı. Ona başa saldı ki, göyqurşağı bizə yaxın görünür, amma yerdən kilometrlərlə uzaqdadır.

Əziz balam Nərmin, bütün azərbaycanlılar kimi biz də Qarabağda Qələbə gününü səbirsizliklə gözləyirik. Azərbaycan bayrağı Laçında, Şuşada, digər işğal altında olan yerlərin ən uca zirvələrində dalğalanacaq. Sən də, uşaqlıq yoldaşların da rənglər dünyası qədər sirli, sehrli olan Qarabağda şad, firavan yaşayacaqsız.

Yağış yağmağa başladı, yerə düşəcək damlaların taleyi məlum deyildi. Yerə çatana qədər yağış damlaları buxarlana və yoxa çıxa bilərdi. Amma yağışdan sonra göyqurşağı mütləq çıxacaqdı.



**Sayad QARAYEVA,**
***Laçın rayon 7 saylı tam orta məktəbin ibtidai sinif müəllimi***

**UNUTMA!**

Laçın rayonu 18 may 1992-ci ildə erməni təcavüzkarları tərəfindən işğal edilib. İşğal nəticəsində Laçın şəhərində, Qayğı qəsəbəsində və 125 kənddə olan 13845 fərdi yaşayış evi, 48 sənaye, 63 kənd təsərrüfatı obyekti, 217 mədəni-maarif, 101 məktəb, 5 məktəbdənkənar, 3 məktəbəqədər müəssisə, 142 səhiyyə, 460 ticarət obyekti itirilmişdir.

Qarabağ müharibəsində 333 nəfər şəhid, 225 nəfər əlil olmuş, 33 nəfər hər iki valideynini itirmiş, 5 nəfər Azərbaycanın Milli Qəhrəmanı adına layiq görülmüşdür. Laçın rayonu işğal edildikdən sonra rayonun 58299 nəfər əhalisi respublikanın 59 rayon və şəhərində müvəqqəti məskunlaşmışdır.




Kompüter və dizayn: **Araz YAQUBOĞLU**
Korrektor: **Firuzə NƏSİBLİ**
Operator: **Cəlal ARİFOĞLU**

Yığılmağa verilmişdir: **07.01.2018**
Çapa imzalanmışdır: **31.03.2018**
Şərti çap vərəqi: **6.** Sifariş **№02**
Kağız formatı: **70x100, 1/16**
Sayı: **350.** Qiyməti: **3 AZN**

*Jurnal* ***"Elm və təhsil"*** *nəşriyyat-poliqrafiya müəssisəsində hazır diapozitivlərdən çap olunmuşdur.*
***E-mail:*** *nurlan1959@gmail.com*
***Tel:*** *(+99412) 497-16-32, (+99450) 311-41-89*
***Ünvan:*** *Bakı, İçərişəhər, 3-cü Maqomayev döngəsi 8/4*